QƏZET 1958-ci İLDƏN NƏŞR OLUNUR

# GƏNC MÜƏLLİM

*Mən Yer üzündə müəllim adından yüksək ad tanımıram.*
**Heydər ƏLİYEV**

İyun 2019
№ 06 (1103)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## Aqrar sahədə yeni subsidiya mexanizminin yaradılması haqqında
### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*



Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, aqrar sahədə tətbiq edilən dəstək tədbirləri ilə bağlı yeni mexanizmin formalaşdırılması, bu sahədə hesabatlılığın, şəffaflığın və büdcə vəsaitlərindən səmərəli istifadənin təmin edilməsi, müraciətlərin sadələşdirilməsi və elektronlaşdırılması məqsədilə, habelə "Kənd təsərrüfatına dövlət dəstəyinin və aqrar sahədə lizinq fəaliyyətinin təkmilləşdirilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 2018-ci il 19 dekabr tarixli 413 nömrəli Fərmanına uyğun olaraq **qərara alıram:**

1. "Kənd təsərrüfatı məhsullarının istehsalının subsidiyalaşdırılması Qaydası" təsdiq edilsin (əlavə olunur).

2. Bu Fərmanın 1-ci hissəsi ilə təsdiq edilmiş Qaydaya əsasən bitkiçilik sahəsində subsidiyaların hesablanmasında istifadə olunan baza məbləği 200 (iki yüz) manat müəyyən edilsin.

3. Azərbaycan Respublikasının Kənd Təsərrüfatı Nazirliyi:

3.1. "Subsidiya" informasiya sisteminin yaradılmasını və bu Fərmanın 1-ci hissəsi ilə təsdiq edilmiş Qaydaya uyğun olaraq subsidiyaların 2020-ci il yanvarın 1-dən etibarən verilməsini təmin etsin;

3.2. Azərbaycan Respublikasının Prezidenti yanında Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar üzrə Dövlət Agentliyi ilə razılaşdırmaqla "Subsidiya" informasiya sistemi haqqında əsasnamənin layihəsini üç ay müddətində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

3.3. kənd təsərrüfatı məhsullarının istehsalçılarına subsidiyaların verilməsinin təşkili üçün xidmət reqlamentlərini beş ay müddətində təsdiq etsin;

3.4. kənd təsərrüfatı məhsulları istehsalının subsidiyalaşdırılmasının nəticələri ilə bağlı ildə bir dəfə Azərbaycan Respublikasının Prezidentinə hesabat versin.

4. Azərbaycan Respublikasının Prezidenti yanında Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar üzrə Dövlət Agentliyi aidiyyəti dövlət qurumları ilə birlikdə "Subsidiya" informasiya sisteminin aşağıdakı məlumatlarla təmin olunması məqsədilə müvafiq informasiya sistemlərinin "Elektron Hökumət" informasiya sistemi vasitəsilə "Elektron kənd təsərrüfatı" informasiya sisteminə inteqrasiyasını Azərbaycan Respublikası Prezidentinin 2018-ci il 12 sentyabr tarixli 263 nömrəli Fərmanı ilə təsdiq edilmiş "Dövlət informasiya ehtiyatları və sistemlərinin formalaşdırılması, aparılması, inteqrasiyası və arxivləşdirilməsi Qaydaları"nın tələblərinə uyğun olaraq təmin etsin:

4.1. istehsalı, idxalı və satışı həyata keçirilən kənd təsərrüfatı istehsal vasitələri və məhsulları barədə məlumatlar, ixtisaslaşmanın aparılması üçün tələb olunan aqroiqlim və hidrometeoroloji məlumatlar;

4.2. kənd təsərrüfatı təyinatlı torpaqlar, onların mülkiyyətçisi, istifadəçisi və icarəçisi barədə aktual məlumatlar.

5. Azərbaycan Respublikasının Nazirlər Kabineti:

5.1. Azərbaycan Respublikası Prezidentinin aktlarının bu Fərmana uyğunlaşdırılması ilə bağlı təkliflərini üç ay müddətində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

5.2. Azərbaycan Respublikası Nazirlər Kabinetinin normativ hüquqi aktlarının bu Fərmana uyğunlaşdırılmasını üç ay müddətində təmin edib Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

5.3. mərkəzi icra hakimiyyəti orqanlarının normativ hüquqi aktlarının bu Fərmana uyğunlaşdırılmasını nəzarətdə saxlasın və bunun icrası barədə beş ay müddətində Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

5.4. bu Fərmandan irəli gələn digər məsələləri həll etsin.

6. Azərbaycan Respublikasının Ədliyyə Nazirliyi mərkəzi icra hakimiyyəti orqanlarının normativ hüquqi aktlarının və normativ xarakterli aktlarının bu Fərmana uyğunlaşdırılmasını təmin edib Azərbaycan Respublikasının Nazirlər Kabinetinə məlumat versin.

7. Azərbaycan Respublikasının Maliyyə Nazirliyi kənd təsərrüfatı məhsulları istehsalçılarına dövlət büdcəsinin vəsaiti hesabına verilən subsidiyalar üzrə 2019-cu ildə yaranmış öhdəliklərin cari ildə ayrılmış büdcə vəsaiti hesabına ödənilməsi mümkün olmadıqda, həmin ödənişlərin növbəti il üçün dövlət büdcəsində bu məqsədlə nəzərdə tutulan vəsait hesabına aparılmasını təmin etsin.

8. Yerli icra hakimiyyəti başçılarının inzibati ərazi dairələri üzrə nümayəndəlikləri həmin ərazidə fəaliyyət göstərən fermerlərin subsidiya ilə bağlı müraciətlərinin "Subsidiya" informasiya sisteminə daxil edilməsində və maarifləndirmənin həyata keçirilməsində iştirak etsinlər.

9. Bu Fərmanın 1-ci və 2-ci hissələri 2020-ci il yanvarın 1-dən qüvvəyə minir.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 27 iyun 2019-cu il*

## Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin müəllimləri musiqi festivalında

Bir il öncə-2018-ci ilin iyul ayında Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin Musiqi və onun tədrisi metodikası kafedrasında Bakı şəhərinin ümumtəhsil məktəblərinin şagirdlərindən ibarət birləşmiş uşaq xoru yaradılmışdur. Son 5 ay ərzində Nərmin Kamilovanın 33 məktəbdən 500 şagirdlə gərgin əməyi nəticəsində layihə ərsəyə gəldi.

1 İyun-Uşaqların Beynəlxalq Müdafiəsi Günündə Bakı Şəhər üzrə Təhsil İdarəsinin Heydər Əliyev Mərkəzinin qarşısında keçirdiyi musiqi festivalının açılışında Nərmin Kamilovanın rəhbərliyi ilə 500 nəfərlik məktəbli xoru Azərbaycan Respublikasının Dövlət Himnini, Siyavuş Kərimlinin "Uşaqlar himni" və Nailə Mirməmmədlinin "Ağlamasın uşaqlar!" mahnısını ifa etdi.



runun təşkili qərara alındı və "Xoşbəxt olsun uşaqlar!" layihəsinin təməli qoyuldu. Layihənin rəhbərləri Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin müdir muavini Nərgiz Səfərova, ADPU-nun Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Musiqi təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin dekanı, dosent Laçın Həsənova, Musiqi və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zemfira Abdullayeva, Musiqi və onun tədrisi metodikası kafedrasının baş müəllimi Nərmin Kamilovadır. Qeyd edək ki, son 40 il ərzində ilk dəfə Azərbaycanda 500 şagirddən ibarət xor təşkil olun-

Tədbirdə iştirak edən Təhsil naziri Ceyhun Bayramov, nazir müavini Firudin Qurbanov, Milli Məclisin deputatı Qənirə Paşayeva, Heydər Əliyev Mərkəzin direktoru Anar Ələkbərov mahnıları dinləyərək, bu təşəbbüsün təqdirəlayiq olduğunu bildirdilər və bu möhtəşəm layihənin ərsəyə gəlməyində əməyi olmuş hər kəsi təbrik etdilər, onlara uğurlar arzuladılar.

**Orxan Abdullayev**

## Afad Qurbanovun 90 illik yubileyinə həsr olunmuş "Müasir dilçiliyin aktual problemləri" Beynəlxalq elmi konfransı

İyunun 7-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) görkəmli dilçi-alim, türkoloq, ictimai xadim, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) müxbir üzvü, latın qrafikalı müasir Azərbaycan əlifbasının müəllifi, Onomastika Elmi Məktəbinin banisi, Əməkdar elm xadimi, Dövlət mükafatı laureatı Afad Qurbanovun 90 illik yubileyinə həsr olunmuş "Müasir dilçiliyin aktual problemləri" Beynəlxalq elmi konfransı keçirilib. Beynəlxalq konfransın iştirakçıları əvvəlcə Fəxri xiyabanda Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin məzarını ziyarət edib, önünə əkili və gül dəstələri düzərək xatirəsinə ehtiramlarını bildiriblər. Xalqımızın görkəmli oftalmoloq alimi, akademik Zərifə Əliyevanın da xatirəsi ehtiramla yad edilib, məzarı önünə gül dəstələri düzülüb. Həmçinin Şəhidlər xiyabanında Azərbaycanın ərazi bütövlüyü və dövlət müstəqilliyi uğrunda həlak olmuş şəhid soydaşlarımızın məzarları və "Əbədi məşəl" kompleksi ziyarət edilib.



Qeyd edək ki, beynəlxalq elmi konfransın yüksək səviyyədə keçirilməsi üçün sədri ADPU-nun rektoru, professor Cəfər Cəfərov olan və tərkibinə universitetin, respublikamızın, eləcə də müxtəlif xarici ölkələrin tanınmış və nüfuzlu alim-mütəxəssislərinin, ziyalılarının daxil edildiyi Təşkilat Komitəsi yaradılıb. Konfransda Türkiyədən, Rusiyadan və digər xarici ölkələrdən alimlər, universitet rektorları, Litvanın ölkəmizdəki fövqəladə və səlahiyyətli səfiri Valdas Lastauskas iştirak ediblər. Konfransdan öncə Afad Qurbanovun zəngin elmi-pedaqoji və ictimai-siyasi fəaliyyətini əks etdirən sərgi nümayiş etdirilib, həmçinin 30 il rəhbərlik etdiyi Azərbaycan dilçiliyi kafedrasında alimin xatirə lövhəsinin açılışı olub. Sonra ADPU-nun Böyük zalında konfransın plenar iclası keçirilib.




Konfransın plenar iclasını giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov qonaqları salamlayaraq onları rəhbərlik etdiyi universitetdə görməkdən məmnunluq və şərəf duyduğunu bildirib. Rektor qeyd edib ki, böyük alim A.Qurbanovun 90 illik yubileyi münasibətilə ölkəmizdə müxtəlif tədbirlər keçirilir.

(Davamı 2-ci səhifədə)

# Afad Qurbanovun 90 illik yubileyinə həsr olunmuş "Müasir dilçiliyin aktual problemləri" Beynəlxalq elmi konfransı

(Əvvəli 1-ci səhifədə)

Görkəmli alim A.Qurbanovun həyatının böyük bir hissəsi ADPU ilə bağlı olub. ADPU-nun rektoru işlədiyi müddətdə universitetin tamamilə yenidən qurulması, maddi-texniki bazanın gücləndirilməsi, təhsilin keyfiyyətinin yüksəldilməsi, yeni kafedraların, regionda ilk hərbi fakültənin yaradılması, çoxmərtəbəli tədris binasının tikintisi, habelə sədri olduğu filologiya və pedaqogika üzrə o zaman respublikada yeganə olan müdafiə şuralarının işinin keyfiyyətinin artırılması A.Qurbanovun adı ilə bağlıdır. Milli Məclisin deputatı, Azərbaycan Əlifba Komissiyasının sədri, latın qrafikalı müasir Azərbaycan əlifbasının müəllifi A.Qurbanovun ölkəmizdə əlifba islahatının aparılmasında misilsiz xidmətləri olmuşdur. Professor A.Qurbanovun çoxsaylı monoqrafiya, dərslik və dərs vəsaitləri dünya və milli dilçilik xəzinəsinin ən kamil, dəyərli incilərindəndir. Məşhur alimin müxtəlif ideyalarla zəngin elmi irsi Azərbaycan dilçilərinin yaradıcılığının inkişafına güclü təsir göstərməkdədir. Bu gün keçirdiyimiz beynəlxalq elmi konfransda səslənən fikirlər, çıxarılan nəticələr dilçilik elmimizin inkişafına müsbət təsir edəcək.

Təhsil nazirinin müavini Məhəbbət Vəliyeva konfrans iştirakçılarını Təhsil Nazirliyinin rəhbərliyi adından salamlayıb və konfransın işinə uğurlar arzulayıb. Nazir müavini bildirib ki, çoxşaxəli və çoxcəhətli elmi fəaliyyəti ilə dilçilik elmimizə layiqli töhfələr verən, özünəməxsus yara-




dıcılıq dəst-xəttinə malik olan A.Qurbanov elmi məktəb yaratmışdır. Şərəfli-müəllim alim ömrü yaşamış A.Qurbanov bacarıqlı və təcrübəli elm və təhsil təşkilatçısı olmuşdur. Vətənpərvər ziyalı A. Qurbanov ölkəmizin ictimai-siyasi həyatında fəal iştirak etmişdir. A.Qurbanov kimi ziyalılar xalqımızın mənəvi sərvətidir. Belə ziyalıların zəngin elmi irsini öyrənmək hər birimizin müqəddəs mənəvi və vətəndaşlıq borcumuzdur.

Türk Dil Qurumunun sabiq sədri, Hacətəppə Universitetinin Sözlükçülük Mərkəzinin sədri, professor Şükrü Halük Akalın çıxışında bildirib ki, professor A.Qurbanov bütün Türk dünyasında, o cümlədən Türkiyədə yaxşı tanınan nüfuzlu bir alim olmuşdur. Böyük alimlə bağlı xatirələrini bölüşən professor Şükrü Halük Akalın vurğulayıb ki, A.Qurbanov gözəl ailə başçısı, qayğıkeş ata olub. 5 övladını faydalı insan, həqiqi vətəndaş, yüksək səviyyəli elmi mütəxəssislər kimi yetişdirib. O, konfransın keçirilməsinə görə Təh-




sil Nazirliyinin və ADPU-nun rəhbərliyinə təşəkkür edib.

Plenar iclasda A.Qurbanovla bağlı sənədli film nümayiş etdirilib.

AMEA-nın Humanitar elmlər bölməsinin akademik-katibi, Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun direktoru, akademik Teymur Kərimli, Litvanın ölkəmizdəki fövqəladə və səlahiyyətli səfiri Valdas Lastauskas, İ.Cavaxişvili adına Tbilisi Dövlət Universitetinin Türk dili və ədəbiyyatı kafedrasının müdiri, professor Marika Jikia, Serbiya Elmlər və İncəsənət Akademiyasının Serb Dili İnstitutunun İdarə Heyətinin üzvü, professor Marija Dindic və başqaları çıxış edərək A.Qurbanovun yüksək intellekt səviyyəsinə,



geniş dünyagörüşünə, zəngin mənəviyyata malik alim, təmkinli və müdrik ziyalı olduğunu xüsusi vurğulayaraq türkologiya elminin inkişa-




fına dəyərli töhfələr verdiyini bildiriblər. Qeyd edilib ki, professor A.Qurbanovun əsərləri Almaniya, Rusiya, İran, Türkiyə, Qazaxıstan, Türkmənistan, Özbəkistan və digər ölkələrdə yayılıb. Məşhur dilçi-alim son 50 ildə dünyanın bir sıra böyük şəhərlərində dilçiliyə, xüsusilə türkologiyaya dair keçirilən konfransların əksəriyyətində aktual və orijinal məruzələrlə çıxış edib.

İclasda A.Qurbanovun fəaliyyətini əks etdirən www.afadgurbanov.az internet səhifəsinin və ingilis, rus, türk dillərində çap edilmiş seçilmiş əsərlərinin təqdimatı da keçirilib.

Bakı Slavyan Universitetinin dekanı, professor Fidan Qurbanova A.Qurbanovun nəşr edilmiş elmi əsərləri barədə məlumat verib.

Professor Yaqub Qurbanov ailə üzvləri adından çıxış edərək tədbirin keçirilməsinə verdiyi dəstəyə görə Təhsil Nazirliyinin və ADPU-nun rəhbərliyinə təşəkkür edib.

Sonra konfrans öz işini 4 elmi bölmədə- Ümumi dilçilik, Türkoloji dilçilik, Onomalogiya, Praktik dilçilik / Azərbaycan ədəbi dili (Müasir Azərbaycan Əlifbası) bölmələrində davam etdirib. Bölmə iclaslarında ümumilikdə 140-dan çox məruzə dinlənilərək müzakirə edilib.

Konfransın bağlanış iclasında sertifikatlar təqdim edilib. Qeyd etmək lazımdır ki, beynəlxalq konfrans elm və təhsil ictimaiyyəti tərəfindən yüksək qiymətləndirilib, elektron və çap mediasında, sosial şəbəkələrdə, televiziya kanallarında geniş işıqlandırılıb.



**Mənsur İbrahimli**

# ADPU-da iki turdan ibarət olimpiadalar və müsabiqələr keçirilib

Azərbaycan Dövlət Pedaqoji Universitetində ümummilli lider Heydər Əliyevin anadan olmasının 96 illiyinə həsr olunmuş Azərbaycan dili, Azərbaycan tarixi, Azərbaycan coğrafiyası, Riyaziyyat, İnformatika, Fizika, Kimya, Biologiya, Psixologiya üzrə olimpiadalar və Təsviri incəsənət, Musiqi üzrə isə müsabiqələr keçirilib. ADPU-nun rektoru, professor Cəfər Cəfərovun müvafiq əmrinə uyğun



olaraq olimpiadalar və müsabiqələr iki turda gerçəkləşib. Olimpiada və müsabiqələrin birinci turunda ADPU üzrə iştirak edən 1364 nəfər tələbədən ikinci turda 85 tələbə iştirak etmək hüququ qazanıb.

Olimpiada və müsabiqələrin ikinci turuna həsr olunmuş tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov iştirak edib. Rektor çıxışında qeyd edib ki, son illər ADPU-da həyata keçirilən islahatlar sayəsində bir çox uğurlar əldə olunub. Həmin məqsədyönlü işlərdən biri də tələbələr arasında olimpiada və müsabiqələrin keçirilməsi ənənəsini yaratmağımızdır. Məhz bu olimpiada və müsabiqələr gələcəkdə yaxşı kadrların seçilməsində mühüm rol oynayacaq. Rektor çıxışında onu da qeyd edib ki, olimpiada və müsabiqələrin keçənilki qaliblərinin mükafatlandırılması mərasimi ölkəmiz və universitetimiz üçün əlamətdar bir günə təsadüf edib. Belə ki, qaliblərin mükafatlandırılması Təhsil naziri cənab Ceyhun Bayramovun, AMEA-nın prezidenti, akademik Akif Əlizadənin və digər nüfuzlu universitet və institutların rəhbərlərinin iştirakı ilə həyata keçirilib. Çıxışının sonunda rektor tələbələrə olimpiada və müsabiqələrdə uğurlar arzulayıb.

Sonra Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov çıxış edərək olimpiada və müsabiqələrin keçirilməsinin tarixi haqqında məlumat verib. Qeyd edib ki, artıq üçüncü ildir ki, universitetimizdə həyata keçirilən olimpiada və müsabiqələr ilk dəfə pilot olaraq Kimya və biologiya fakültəsində həyata keçirilib. Həmin ildən sonra Azərbaycan dili, Azərbaycan tarixi, Azərbaycan coğrafiyası, Riyaziyyat, İnformatika, Fizika, Kimya, Biologiya, Psixologiya üzrə olimpiadaların və Təsviri incəsənət, Musiqi üzrə isə müsabiqələrin keçirilməsini qərara aldıq. Professor A.Zamanov bildirib ki, Təsviri incəsənət və Musiqi üzrə müsabiqələrin birinci turu yekunlaşıb və ikinci tura keçmiş tələbələrin işlərini qiymətləndirmək üçün Münsiflər Heyəti müəyyən edilib. Ümummilli lider Heydər Əliyevin anadan olmasının 96 illiyinə həsr olunmuş olimpiada və müsabiqələrin qaliblərinin 15 İyun - Milli Qurtuluş Günündə mükafatlandırılmasının nəzərdə tutulduğunu qeyd edən professor A.Zamanov gələcəkdə bu olimpiada və müsabiqələrin respublika universitetləri üzrə keçirilməsinə çalışılacağını bildirib.

Sonra Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Alıyev Azərbaycan dili, Azərbaycan tarixi, Azərbaycan coğrafiyası, Riyaziyyat, İnformatika, Fizika, Kimya, Biologiya, Psixologiya üzrə olimpiada iştirakçılarını təlimatla tanış edib. Daha sonra isə olimpiadanın sualları möhürlü zərflərdən çıxarılaraq iştirakçılara paylanılıb. İştirakçılara 2 saat müddətində cavablandırmaq üçün 5 sual təqdim olunub. Olimpiadaya peşəkar zal nəzarətçiləri və koordinatorlar tərəfindən nəzarət olunub.

**Günay Bağırlı**

# 15 İyun - Milli Qurtuluş Gününə həsr olunmuş tədbir

İyunun 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 15 İyun- Milli Qurtuluş Gününə həsr olunmuş tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, şöbə və bölmə müdirləri, müəllim və tələbələr iştirak ediblər. Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlayıb.



Giriş sözü ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbir iştirakçılarını 15 İyun-Milli Qurtuluş Günü münasibətilə təbrik edib, onlara uğurlar arzulayıb. Rektor bildirib ki, 1993-cü ilin iyun ayında ölkəmizdə faktiki olaraq vətəndaş müharibəsi təhlükəsi yaranmışdı, dövlət parçalanmaq, dağılmaq təhlükəsi ilə qarşılaşmışdı. Yalnız ümummilli lider Heydər Əliyevin böyük siyasi təcrübəsi, qətiyyəti və iradəsi nəticəsində bu təhlükələrin qarşısı alındı. Ulu öndər Heydər Əliyev öz xilaskarlıq missiyasını cəsarətlə və uğurla yerinə yetirərək ölkəmizdə ictimai-siyasi böhranı, vətəndaş müharibəsi təhlükəsini, separatçılıq cəhdlərini qətiyyətlə aradan qaldırdı, müstəqilliyimizi, dövlət və dövlətçiliyimizi qorudu. Heydər Əliyevin 1993-cü il iyun ayının 15-də xalqımızın inadlı və təkidli tələbi ilə Azərbaycanda yenidən siyasi hakimiyyətə gəlməsi dövlətçilik tariximizin şanlı və parlaq səhifəsidir. Qürur hissi ilə deyə bilərik ki, ADPU-nun müəllimləri Heydər Əliyevin yenidən siyasi hakimiyyətə gəlməsində fəal iştirak ediblər. Müstəqil Azərbaycan Respublikası ulu öndər Heydər Əliyevin şah əsəridir. Qədirbilən xalqımız dahi şəxsiyyət, müdrik lider Heydər Əliyevin xidmətlərini yüksək qiymətləndirir və hər il 15 İyun-Milli Qurtuluş Gününü yüksək əhvali-ruhiyyə ilə qeyd edir.





Tədbirdə Tarix və coğrafiya fakültəsinin Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının baş müəllimi Taleh Cəfərov 15 İyun- Milli Qurtuluş Günü haqqında məruzə ilə çıxış edib. T.Cəfərov çıxışında qeyd edib ki, 15 İyun-Milli Qurtuluş Günü böyük ictimai, siyasi və tarixi əhəmiyyət kəsb edən bir gündür. Heydər Əliyev 1993-cü ilin iyununda genişlənmək təhlükəsi olan vətəndaş müharibəsini dayandırmaq üçün ağıllı, düşünülmüş siyasi tədbirlər həyata keçirdi. Heydər Əliyev böyük idarəetmə və dövlətçilik təcrübəsi sayəsində separatçılıq meyillərinin, dağıdıcı ictimai-siyasi proseslərin, dövlət çevrilişlərinə cəhd cinayətlərinin qarşısını qətiyyətlə aldı. Xalq dövlət müstəqilliyimizin təminatçısı olan Heydər Əliyevi dəstəklədi, siyasi yetkinlik, dövlətçilik prinsiplərinə sədaqət nümayiş etdirdi.15 İyun-Milli Qurtuluş Günü Milli Məclisin qərarı ilə 1997-ci il iyunun 27-də rəsmiləşdirildi. Həmin vaxtdan xalqımız 15 İyunu əlamətdar bir tarixi gün kimi qeyd edir.

Müəllim və tələbələrin fəal iştirakı ilə keçən tədbirdə Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, rektorun müşaviri, 91 vətənpərvər ziyalıdan biri, Yeni Azərbaycan Partiyasının Siyasi Şurasının üzvü, professor Vilayət Əliyev, Tələbə Gənclər Təşkilatının sədr müavini Taleh Mirzəyev çıxış edərək ulu öndər Heydər Əliyevin xalqımız və dövlətimiz qarşısında göstərdiyi böyük xidmətlər, o cümlədən elmin, təhsilin, mədəniyyətin, gənclərin inkişafına göstərdiyi xüsusi diqqət və qayğı barədə fikirlərini bölüşüblər.

**Mahirə Mustafayeva**

# ADPU-nun tələbələri olimpiada və müsabiqədə uğurlarına görə mükafatlandırılıblar

İyunun 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Heydər Əliyev məktəbinin lektoriyasında ümummilli lider Heydər Əliyevin anadan olmasının 96 illiyinə həsr olunmuş Azərbaycan dili, Azərbaycan tarixi, Azərbaycan coğrafiyası, riyaziyyat, informatika, fizika, kimya, biologiya, psixologiya üzrə olimpiadaların və təsviri incəsənət, musiqi üzrə müsabiqələrin qaliblərinin mükafatlandırma mərasimi keçirilib. Tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, prorektorlar, fakültə dekanları, struktur bölmə rəhbərləri və olimpiada və müsabiqələrin qalibləri iştirak ediblər.



Tədbiri giriş sözü ilə açan rektor Cəfər Cəfərov tədbir iştirakçılarını və tələbələri salamlayaraq olimpiada və müsabiqələrdə böyük uğur qazanmış tələbələri təbrik edib, onlara yeni uğurlar arzulayıb. Rektor bildirib ki, rəqabət mühitinin yaradılması tələbələrin daha çox öz üzərlərində çalışmalarına, bilik və bacarıqlarının yüksəlməsinə və bir sözlə, təhsildə və elmdə irəliləmələrinə motivasiya yaradır, həmçinin də stimullaşdırır. Bu gün uğur qazanan hər bir tələbə gələcəkdə böyük qürur hissi ilə keçmiş uğurlarından öz yetirmələrinə, övladlarına danışacaq. Biz artıq universitetdə bir çox istiqamətlər üzrə tələbələrimizi fəallığa, dərin araşdırmaya, gərgin çalışmaya həvəsləndiririk. Bilirsiniz ki, artıq Pedaqoji Universitetdə adlı təqaüdər təsis edilib və cari ildən bu ada layiq görülən tələbələr dövlətin verdiyi təqaüddən əlavə universitetin təsis etdiyi adlı təqaüdləri də alacaqlar. Pedaqoji Universitetin tələbələri bir çox müsabiqə və layihələrdə də həmişə yüksək nəticələr göstərərək universitetimizin adını ucaldırlar. Mayın 25-də Bakı Konqres Mərkəzində təşkil edilən "Enactus Azərbaycan" yarışmasında universitetimizin "Enactus" komandasının Azərbaycanın 14 güclü komandası arasından finala yüksələrək 4-cü yerə layiq görülməsi bizim üçün böyük uğurdur. Bir neçə gün öncə universitetimizdə baş tutan "Startap Azərbaycan" müsabiqəsi çərçivəsində tələbələrimizin böyük yarışma mədəniyyətinin, biznes ideyaları vermək qabiliyyətlərinin, layihə təqdim etmək bacarıqlarının şahidi olduq. Həmin tələbələr universitetimizin minlərlə tələbəsi arasından fərqlənərək irəli çıxmağı bacarıblar və buna görə də qiymətli hədiyyələrlə, diplom və sertifikatlarla təltif olunublar, - deyə professor Cəfər Cəfərov bildirib.



Rektor Cəfər Cəfərov çıxışında ADPU-da olimpiada və müsabiqələrin son üç ildə hər il keçirilməsinə böyük önəm verib və bunun vacibliyindən danışıb. Qeyd edib ki, olimpiadalar tələbələrin fəallığını artırır, elmə marağını dərinləşdirir, bu isə müasir dövrdə tələbə hazırlığına, kadr yetişdirilməsinə böyük köməkdir.

Rektor olimpiada və müsabiqə qaliblərini, qalibləri yetişdirən, hazırlayan professor-müəllim heyətini təbrik etdikdən sonra sözü Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanova verib.

Professor Asəf Zamanov ADPU-da ümummilli lider Heydər Əliyevin anadan olmasının 96 illiyinə həsr olunmuş iki turdan ibarət olimpiada və müsabiqələrin təşkil edilməsindən, keçirilmə və qiymətləndirmə forması haqqında məlumat verərək, qaliblərə istiqamətlər üzrə I, II və III dərəcəli diplom və hədiyyələrin təqdim olunacağını bildirib.

Qeyd edib ki, ümumilikdə olimpiada və müsabiqələrdə ADPU üzrə iştirak edən 1364 nəfər tələbədən 85 nəfər tələbə ikinci turda iştirak etmək hüququ qazanıb və onlardan 30 nəfər tələbə 1-ci, 2-ci və 3-cü yer nominasiyaları üzrə qalib gəliblər.

Professor A.Zamanov vurğulayıb ki, builki olimpiada və müsabiqələrin keçirilməsi ümummilli lider Heydər Əliyevin anadan olmasının 96-cı ildönümünə həsr edildiyindən işə 10 May ərəfəsində başladıq və 15 İyun - Milli Qurtuluş Günü ərəfəsində qalib gəlmiş tələbələri mükafatlandırırıq. Təbii ki, olimpiada və müsabiqələrdə iştirak edən və yer tutan tələbələr böyük qürur və həyəcan hissi ilə hansı yerlərə layiq görüldüklərini gözləyirlər. Ona görə də mükafatlandırma və təltifetmə mərasiminə başlamağı məqsədəuyğun hesab edirəm.

Təqdimetmə mərasimində fakültə dekanları tərəfindən III dərəcəli, prorektorlar tərəfindən II dərəcəli, rektor Cəfər Cəfərov tərəfindən I dərəcəli diplomlar və hədiyyələr qaliblərə təqdim edilib.

Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov çıxış edərək olimpiada və müsabiqələrin əhəmiyyətindən danışaraq qalib tələbələri təbrik ediblər.

Qalib tələbələr sevinclərini bölüşərək belə bir şəraiti yaratdığına görə ADPU-nun rəhbərliyinə, fakültə dekanlarına və müəllimlərinə minnətdarlıqlarını bildiriblər.

Rektor Cəfər Cəfərov olimpiada və müsabiqələrin yüksək səviyyədə təşkilinə görə Elm və innovasiyalar üzrə prorektor, professor A. Zamanova və müvafiq struktur bölmələrə təşəkkür edib.

Sonda xatirə şəkli çəkdirilib.

**Könül Nəzərova**



## ADPU-nun əməkdaşları EQAC layihəsi çərçivəsində İspaniyada keçirilmiş təlimdə iştirak ediblər

İyunun 2-9-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) də tərəfdaşlarından biri olduğu "Azərbaycan universitetlərində Keyfiyyətin təminatı mərkəzlərinin yaradılması və inkişaf etdirilməsi" (EQAC) layihəsi çərçivəsində İspaniyaya təlim səfəri baş tutub. Təlimdə ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Rektorun iqtisadi məsələr üzrə müşaviri Ümid Mehdiyev, Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi, layihənin universitet üzrə meneceri Lətif Kəngərlinski və həmin şöbənin mütəxəssisi Günay Məhərrəmova iştirak ediblər.



Avropa İttifaqının maliyyə dəstəyi ilə Erasmus+ proqramı üzrə Bakı Biznes Universitetinin koordinatorluğu ilə həyata keçirilən EQAC layihəsi çərçivəsində təşkil olunmuş təlim İspaniyanın Alikante şəhərində yerləşən Alikante Universitetində keçirilib. Sözügedən layihədə Azərbaycan Respublikasının Təhsil Nazirliyi, ölkəmizin 11 ali təhsil müəssisəsi və Avropadan 5 tərəfdaş müəssisə iştirak edir. Təhsildə keyfiyyətin təmin olunması siyasəti və alətlər, müxtəlif sorğuların aparılmasının əhəmiyyəti, tədris və idarəetmənin keyfiyyətinin qiymətləndirilməsi, ali təhsildə keyfiyyətin təminatı ilə bağlı beynəlxalq təcrübə, standartlar və s. haqqında xarici ekspertlər tərəfindən təqdimatlar nümayiş etdirilib.

Təlimin ilk günündə Azərbaycan universitetlərinin hər biri özünütəhlil hesabatlarını təqdimat şəklində nümayiş etdiriblər. Avropa ali təhsil məkanında keyfiyyətin təminatı üzrə standartlar və qaydalara (ESG) müvafiq olaraq hazırlanmış hesabatlar Avropa ekspertləri tərəfindən dəyərləndirilib, tövsiyələr verilib. Sonra hesabatdakı bəzi konkret məsələlərlə bağlı qruplar üzrə müzakirələr aparılıb. Növbəti gün keyfiyyətin təminatı mexanizmləri, ali təhsildə monitorinq və əsas keyfiyyət indikatorları üzrə Alikante Universitetinin təcrübəsi haqqında təqdimatlar olub.

Digər günlərdə innovativ tədrisin əhəmiyyəti, konkret dərs nümunələri əsasında layihə əsaslı tədrisin səmərəliliyi, professor-müəllim heyətinin təlimlərə cəlb edilməsi, karyera inkişafı strategiyasına dair İngiltərə təcrübəsi paylaşılıb. Midlsaks Universitetində istifadə olunan məlumat bazası, onun işləmə mexanizmi, əhəmiyyəti haqqında təqdimatlar olub, əsas xüsusiyyətləri izah edilib. Sonuncu gün isə hər bir universitet tərəfindən ESG standartları üzrə görəcəyi işlərə dair fəaliyyət planı hazırlayıb və layihə menecerləri tərəfindən təqdim edilib. Təlimin sonuncu günündə isə həftə ərzində verilmiş məlumatlar ümumiləşdirilib, layihənin gedişi və gələcək planlara dair müzakirələr aparılıb, təlim iştirakçılarının iştirakı ilə Alikante Universitetinin kampusu, muzeyi, kitabxana, oxu zalı ilə tanışlıq gəzintisi təşkil edilib.

Qeyd etmək lazımdır ki, son illərdə ADPU-nun rektoru, professor Cəfər Cəfərovun rəhbərliyi ilə məhz keyfiyyətə əsaslanan inkişafı təmin etmək məqsədilə tədris, elm, inzibati idarəetmə sahələrində islahatlar aparılır, universitetin beynəlxalq əlaqələri, layihələrdə iştirakı genişləndirilir. Bununla yanaşı, universitetin professor-müəllim heyətinin, kafedra və fakültələrin illik fəaliyyətlərinin vahid və obyektiv meyarlarla qiymətləndirilməsi, vakansiyaların obyektiv, şəffaf, geniş müsabiqə yolu ilə tutulması, tədris planlarının təkmilləşdirilməsi, tələbələrin biliyinin obyektiv və şəffaf qiymətləndirilməsi və s. istiqamətlərdə davamlı işlər həyata keçirilir.

**Nurlan Səmədov**

# ADPU-da "Startap günləri"

Azərbaycan İnternet Forumu Azərbaycan Respublikasının Prezidenti Yanında Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar üzrə Dövlət Agentliyinin və Azərbaycan Beynəlxalq Bankının və SİNAM şirkətinin dəstəyi ilə "Startap Azərbaycan" və "Startap günləri" layihəsinə start verilib. Layihə çərçivəsində bir sıra universitetlərdə və digər təhsil müəssisələrində "Startap günləri"nin və bu tədbirlərin yekununda "Startap Azərbaycan" adlı Milli konfransın keçirilməsi nəzərdə tutulub. Bunun üçün dosent Yusif Alıyev Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) sahə üzrə əlaqələndirici şəxsi müəyyən edilib və nümayəndə layihənin hazırlıq mərhələsində iştirak edib.



"Azərbaycan Respublikasında innovativ inkişaf sahəsində koordinasiyanın təmin edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 10 yanvar 2019-cu il tarixli 881 nömrəli Sərəncamının icrasını təmin etmək məqsədilə ADPU-nun rektorunun müvafiq razılığı ilə 31 may - 1 iyun 2019-cu il tarixlərdə ADPU-da "Startap günləri"nin təşkili nəzərdə tutulub.

Mayın 29-da Azərbaycan İnternet Forumunun prezidenti Osman Gündüz ADPU-nun layihə iştirakçıları ilə görüşüb və tələbələrə layihələrin irəli sürülməsi, hazırlanması, təqdimatı ilə bağlı məlumatlar verib.

Layihənin əsas məqsədi ölkədə İKT sektorunda investisiya mühitini yaxşılaşdırmaq, ən yaxşı İnternet və İT layihələrini üzə çıxarmaq, innovativ ideyaların uğurlu biznes sahəsinə çevrilməsinə yardım etməkdir.

Mayın 3-də layihənin açılış mərasimi keçirilib. Tədbirdə ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Alıyev, Azərbaycan İnternet Forumunun prezidenti Osman Gündüz, Azərbaycan Beynəlxalq Bankının, Azərbaycan Respublikasının Prezidenti Yanında Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar üzrə Dövlət Agentliyinin və SİNAM təşkilatının nümayəndələri, həmçinin ADPU-nun struktur bölmə rəhbərləri, professor-müəllim heyəti və tələbələr iştirak ediblər.

Tədbiri giriş sözü ilə ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov açaraq son illər ölkəmizdə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin birbaşa rəhbərliyi ilə Strateji Yol Xəritələrinin tələbləri əsasında həyata keçirilən innovativ işlər haqqında məlumat verərək ali təhsil müəssisəsi olaraq ADPU-nun da fəaliyyətində bu istiqamətlərin prioritet təşkil etdiyini vurğulayıb, "Startap günləri" yarışmasının universitet üçün önəmli olduğunu qeyd edərək tələbələrin biznes ideyalarının yaranması və inkişaf etməsi baxımından əhəmiyyətli olduğunu bildirib.

Sonra Azərbaycan İnternet Forumunun prezidenti Osman Gündüz çıxış edərək bildirib ki, "Azərbaycan Respublikasında innovativ inkişaf sahəsində koordinasiyanın təmin edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 10 yanvar 2019-cu il tarixli 881 nömrəli Sərəncamının icrasını təmin etmək məqsədilə həyata keçirilən "Startap günləri" ali məktəb tələbələrinin biznes ideyalarının irəli sürülməsi və reallaşdırılması baxımından çox əhəmiyyətlidir. Burada tələbələr öz ideyalarını dəyərləndirmək və gerçəkləşdirmək imkanı qazanır, həmçinin tanınmış startap nümayəndələri ilə əlaqələr qurmaq imkanı əldə edirsiniz, - deyə O.Gündüz bildirib. Qeyd edib ki, ölkəmizdə innovasiyaların inkişafı ilə bağlı müxtəlif layihələr, tədbirlər həyata keçirilir. Böyük professor-müəllim və tələbə heyətinə malik olan ADPU-nun rəhbərliyinin bu işə xüsusi əhəmiyyət verməsi təqdirəlayiqdir.

O.Gündüz qeyd edib ki, seçim prosesi təşkilatçılar tərəfindən aparılacaq. Seçimdə İT sahəsində müəyyən layihələrin müəllifləri və iştirakçıları olmuş şəxslərə üstünlük veriləcək.

Layihənin birinci günü ADPU-nun müxtəlif fakültələrinin tələbələrindən ibarət 60 nəfər tələbə arasından ideya verən 26 tələbə seçilib və 5 komandaya ayrılaraq ideyaları ilə bağlı tədqiqatlara başlayıblar.

Peşəkar mentorlar tərəfindən tələbələrə internet-biznesini yaratmaq istəyənlərə ideyalarının gerçəkləşdirilməsi, sərmayə tapılması, biznesin idarə edilməsi istiqamətində bir çox məsləhətlər verilib. Bildirilib ki, layihələr elmi-tədqiqat, araşdırma tipli olmamalıdır. Bu tip layihələr Startap Azərbaycan çərçivəsində keçirilən müsabiqə və digər yarışmalara qəbul edilmir. İkinci gün isə komandalar öz ideyaları ətrafında slaydlar şəklində təqdimatlar hazırlayıblar və bu təqdimatları 5 dəqiqə ərzində ekspertlərə təqdim ediblər. Bu təqdimatları yarışmada iştirak edən startap münsifləri qiymətləndirib. Yarışmada 3 komanda 1-ci, 2-ci və 3-cü yer nominasiyaları üzrə qalib seçiliblər. Sonda 1-ci yerin qaliblərinə qiymətli hədiyyələr və diplom, ikinci və üçüncü yerin qaliblərinə də sertifikat və qiymətli hədiyyələr təqdim edilib. Həmçinin Azərbaycan İnternet Forumu və Azərbaycan Respublikasının Prezidenti Yanında Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar üzrə Dövlət Agentliyi tərəfindən tədbiri yüksək səviyyədə təşkil etdiyinə görə ADPU rəhbərliyi diplom və təşkilatçılar isə təşəkkürnamə ilə mükafatlandırılıb.

Qeyd edək ki, Azərbaycan Respublikasının Prezidenti yanında Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar üzrə Dövlət Agentliyinin dəstəyi ilə Startap Azərbaycanın təşkilatçılığı, Azərbaycan Beynəlxalq Bankı və SİNAM şirkətinin dəstəyi ilə həyata keçirilən layihənin yekununda ali təhsil müəssisələrinin qalib komandaları ilə "Startap Azərbaycan" yarışması keçiriləcək.

## Qazaxıstan Respublikasının Qazax Milli Qızlar Pedaqoji Universitetinin nümayəndələri ilə görüş

**İyunun 14-də Qazaxıstan Respublikasının Qazax Milli Qızlar Pedaqoji Universitetinin rektoru Qauxar Aldamberqenovanın rəhbərlik etdiyi nümayəndə heyəti ADPU-da olublar.**





Qonaqları salamlayan rektor, professor Cəfər Cəfərov universitetin tarixi, tədris prosesi, qarşıda duran vəzifələr, təhsilverənlərin fəaliyyətinin təkmilləşdirilməsi və keyfiyyətli nəticələrin əldə edilməsi məqsədilə aparılan islahatlar haqqında geniş məlumat verib.

Görüşdə Qazax Milli Qızlar Pedaqoji Universitetinin rektoru da öz növbəsində rəhbərlik etdiyi ali təhsil müəssisəsi haqqında məlumatı ADPU rəhbərliyinin diqqətinə çatdırıb. Rektor iki universitet arasında əlaqələrin qurulması, əməkdaşlığın perspektivləri barədə fikirlərini qeyd edib.

Görüş zamanı gələcək əməkdaşlıq imkanları haqqında müzakirələr aparılıb və tərəflər arasında anlaşma memorandumu imzalanıb.

## ADPU-nun bir qrup ingilis dili müəlliminə sertifikatlar verilib

**İyunun 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) bir qrup ingilis dili müəlliminə ABŞ-ın ölkəmizdəki Səfirliyinin dəstəyi ilə həyata keçirilən layihələr çərçivəsində sertifikatların verilməsi mərasimi keçirilib.**



Tədbiri giriş sözü ilə açan rektor, professor Cəfər Cəfərov bildirib ki, bu gün dərs prosesində innovativ təlim metodlarından lazımınca faydalana bilən, dərsin məzmununun səmərəli şəkildə mənimsənilməsini təmin edən bacarıqlı təhsilverənin formalaşdırılması, müəllimlərin peşəkarlıq səviyyəsinin yüksəldilməsi kimi məsələlər hər bir ali təhsil müəssisəsinin diqqət mərkəzində olduğu kimi ADPU-nun da qarşıya qoyduğu əsas prioritetlərdən biridir. Pedaqoji Universitet olaraq tədris prosesinin təkmilləşdirilməsi məqsədilə yaradılan imkanların ingilis dilinin tədrisi səviyyəsinin artırılmasına yönəlik olması da xüsusi vurğulanmalıdır. Belə ki, ingilis dilinin tədrisinin təkmilləşdirilməsi, professor-müəllim heyətinin peşəkarlıq səviyyəsinin artırılması məqsədilə bir neçə əhəmiyyətli layihələr həyata keçirilib. Bunlardan ən önəmlisi ABŞ Dövlət Departamentinin maliyyə dəstəyi əsasında ABŞ-ın ölkəmizdəki Səfirliyinin müxtəlif təhsil və ingilis dili proqramları çərçivəsində xarici mütəxəssislərin universitetə cəlbidir. Rektor aprel ayından ingilis dili müəllimlərinə xarici dilin tədrisində kommunikativ və interaktiv metodun istifadəsinə dair təlimlər aparan, müəllimlərin dərslərini müşahidə etməklə onların inkişafına dəstək olan Diane Whaleyə universitetin kollektivi adından təşəkkürünü bildirib.

ABŞ Səfirliyinin mədəniyyət məsələləri üzrə müşaviri xanım Heidi Smith səfirliyin əməkdaşlığa hər zaman açıq olduğunu qeyd edib və təlimlərdə iştirak edən müəllimlərə gələcək fəaliyyətlərində uğurlar arzulayıb.

Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova qeyd edilən "İngilis dili mütəxəssis" proqramı ilə yanaşı, ingilis dilinin tədrisi prosesinin təkmilləşdirilməsi məqsədilə ADPU, Azərbaycan Müəllim İnkişafı Mərkəzi (AMİM) və ABŞ-ın ölkəmizdəki Səfirliyinin birgə təşəbbüsü ilə həyata keçirilən layihənin əhəmiyyətindən danışıb. Ekspertə və tərəfdaşlara təşəkkürünü bildirərək bu tip layihələrin müəllimlərin peşəkarlıq səviyyəsinin artırılmasında xüsusi rolu olduğunu vurğulayıb.

Diane Whaley ABŞ Dövlət Departamentinin maliyyələşdirdiyi "İngilis dili mütəxəssisi" proqramı çərçivəsində ADPU-da ikinci dəfə fəaliyyət göstərdiyini, aprel ayından etibarən bir qrup müəllimin iştirak etdiyi təlimlərdə kommunikativ metod və tələbə-əsaslı yanaşma haqqında nəzəri və metodoloji mövzulara toxunduqlarını qeyd edib. Müəllimlərin əzmini, öyrənmək şövqünü xüsusi vurğulayan mütəxəssis universitet rəhbərliyinə yaradılan şərait üçün minnətdarlıq edib və müəllimlərə uğurlar arzulayıb.

AMİM-un direktor müavini Xədicə Cəfərova birgə layihənin əhəmiyyətindən, müəllimlərin bacarıqlarının artırılması baxımından vacibliyindən danışıb.

Sonra Diane Whaleyin təlimlərində iştirak etmiş 27 nəfər müəllimə, həmçinin AMİM-lə birgə icra olunan layihə çərçivəsində təlim keçmiş 12 nəfər müəllimə, təlimlərin təşkilinə könüllü qoşulmuş 2 nəfər tələbəyə sertifikatlar verilib.

Sonda xatirə şəkli çəkdirilib.

## 26 İyun-Azərbaycan Respublikası Silahlı Qüvvələri Gününə həsr olunmuş elmi konfrans

İyunun 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin Fiziki tərbiyə və çağırışaqədərki hazırlığın tədrisi metodikası kafedrasında 26 İyun-Azərbaycan Respublikası Silahlı Qüvvələri Gününə həsr olunmuş elmi konfrans keçirilib.



Konfransı giriş sözü ilə açan Fiziki tərbiyə və çağırışaqədərki hazırlığın tədrisi metodikası kafedrasının müdiri Eldar Abdullayev geniş məruzə ilə çıxış edib. E.Abdullayev maraqlı və məzmunlu məruzəsində qeyd edib ki, müasir Azərbaycanın qurucusu, ümummilli liderimiz Heydər Əliyev yenidən ölkəmizdə siyasi hakimiyyətə qayıtdıqdan sonra ordu quruculuğu prosesi uğurla həyata keçirilib.

Son illər Azərbaycan Respublikasının Prezidenti, Silahlı Qüvvələrin Ali Baş Komandanı İlham Əliyevin rəhbərliyi ilə maddi-texniki bazası daha da güclənən, müasir hərbi texnika, silah-sursatla təhciz edilən Azərbaycan Silahlı Qüvvələri dünyanın ən qüdrətli ordularından birinə çevrilib. Hazırda Azərbaycan Ordusu dünyanın ən güclü 50 ordusu sırasındadır. Xalqımız bundan böyük sevinc və qürur hissi duyur və ordumuzun gücünə, qüdrətinə inanır.

Sonra məruzə ətrafında çıxış edən professor Əli Mehdiyev,dosent Gülbaba Quliyev, baş müəllimlər Natiq Əliyev, Laçın Əsgərov və başqaları məruzəni yüksək qiymətləndirərək Azərbaycanın nizami, müasir və qüdrətli orduya malik olmasını xüsusi vurğulayıblar.

## UNİCEF-in nümayəndələri ADPU-da

İyunun 20-də UNİCEF-in Avropa və Mərkəzi Asiya üzrə Regional Təhsil məsləhətçisi Parmosivea Soobrayan və UNİCEF-in Azərbaycanda təhsil üzrə mütəxəssisi Leyla Həsənova Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) olublar. Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Fuad Tağızadə və şöbənin mütəxəssisi Günay Məhərrəmova iştirak ediblər.



Qonaqları salamlayan rektor, professor Cəfər Cəfərov universitetin yaranma tarixi, fəaliyyət istiqamətləri və strukturu haqqında geniş məlumat verib. Tədrisin keyfiyyətinin yaxşılaşdırılması üçün həyata keçirilən islahatlardan, pedaqoji kadr hazırlığının məsuliyyətindən və müəllim peşəsinin artan nüfuzundan bəhs edən rektor qonağın universitet müəllimlərinin təlim və tədqiqat kompetensiyaları haqqında suallarını cavablandırıb. Müxtəlif layihələr çərçivəsində müəllimlərin müxtəlif beynəlxalq təlimlərə cəlb olunmasının tədrisin keyfiyyətinin yüksəldilməsində rolundan danışan rektor ADPU-nun UNİCEF-lə əməkdaşlıqda maraqlı olduğunu qeyd edib. Bu istiqamətdə bir neçə təkliflə çıxış edən prorektor Eldar Aslanov UNİCEF-in və Təhsil Nazirliyinin dəstəyi ilə əldə edilməsi mümkün olan nəticələr barədə öz fikirlərini bölüşüb.

Sonda tədris binasında keçirilən imtahan prosesi ilə tanış olan qonaqlar göstərilən diqqətə görə rəhbərliyə təşəkkür ediblər.

## ADPU və Corc Vaşinqton Universiteti arasında Birgə Bəyannamə imzalanıb

**İyunun 25-də Corc Vaşinqton Universitetinin Təhsil və İnsan İnkişafı Məktəbinin nümayəndə heyəti Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) səfərdə olub. Geniş tərkibdə keçirilən görüşdə dekan, doktor Maykl Föyer, akademik dekan, professor Kolin Qrin, doktor Elizabet Qrant, Keyt Brannon, Sevinc Məmmədova, eləcə də Təhsil Nazirliyinin Beynəlxalq Əməkdaşlıq Departamentinin müdiri Nicat Məmmədli iştirak ediblər.**



ADPU-nu isə rektor, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, rektorun müşaviri Ümid Mehdiyev, Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, Tədqiqat və inkişaf şöbəsinin müdiri Şəhla Gülməmmədova, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Fuad Tağızadə və bu şöbənin əməkdaşları Lətif Kəngərlinski və Könül Həsənova təmsil ediblər. Görüş zamanı qonaqlara universitet haqqında ətraflı məlumat verilib, qarşılıqlı əməkdaşlıq imkanları müzakirə edilib.

Xüsusilə, ikili diplom layihəsinin başlanması ilə əlaqədar görüləcək işlər, bu layihənin təhsilimizə verəcəyi töhfələr, mövcud kadr potensialı və digər imkanlar haqqında fikir mübadiləsi aparılıb. Görüş universitetlərarası Birgə Bəyannamənin imzalanması ilə başa çatıb. Tərəflər ikili diplom proqramının təşkili üzrə danışıqları davam etdirmək qərarına gəlib.



Sonda tələbə və müəllimlərlə görüş keçirilib, Corc Vaşinqton Universiteti, eləcə də tələbələr üçün planlaşdırılan proqram üzrə yaradılacaq imkanlar haqqında məlumat verilib, onları maraqlandıran suallar cavablandırılıb.

# ADPU Tbilisidə Şərq Tərəfdaşlığı ölkələrində təhsil və mədəniyyət məsələlərinə həsr olunmuş konfransda təmsil olunub

**25-26** iyun 2019-cu il tarixlərdə Tbilisidə keçirilən "Şərq Tərəfdaşlığı" çərçivəsində təhsil və mədəniyyət sahələrində ümumi dəyərlərin təşviqi" mövzusunda beynəlxalq konfransda Azərbaycan Respublikası Təhsil nazirinin müavini Firudin Qurbanovun rəhbərliyi ilə nümayəndə heyəti iştirak edib. Təhsil və mədəniyyətlə bağlı müasir dövrün tələbləri, təhsil sahəsində islahatların aparılması, milli-mənəvi dəyərlərin təbliği, qorunması və bu kimi digər məsələlər konfransın əsas müzakirə mövzusunu təşkil edib.

Azərbaycan nümayəndə heyətinin rəhbəri Firudin Qurbanov panel iclasda çıxış edərək Azərbaycanda təhsilin inkişafı, bu sahədə qəbul olunmuş dövlət proqramlarından, ölkəmizin multikultural ənənələrindən, milli və mədəni dəyərlərin qorunması istiqamətində görülən işlərdən bəhs edib. Nazir müavini həmçinin Azərbaycanda təhsilin infrastrukturunun yenilənməsi ilə bağlı atılan addımlar barədə də ətraflı məlumat verib.




Tədbirin ikinci günündə Azərbaycan Dövlət Pedaqoji Universitetinin Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə Avropa Birliyi tərəfindən qəbul olunmuş ümumi dəyərlərin tədris prosesində hansı fənlər və vasitələrdən istifadə etməklə tələbələrə təlqin edilməsi, ADA Universitetinin Təhsildə İnnovasiyalar Mərkəzinin rəhbəri Ülviyyə Mikayılova orta və ali təhsildə inklüziv təhsilə dair öz təcrübəsi barədə çıxış ediblər.

"Ümumi dəyərlərin təşviqində müəllimlərin rolu" adlı paralel sessiyada "Azərbaycanın müsalında: öyrətmə və öyrənmə prosesi vasitəsilə ümumi dəyərlərin təşviq edilməsi" adlı təqdimatla çıxış edən Nigar Abbaszadə təmsil etdiyi ali təhsil müəssisəsi, həyata keçirilən beynəlxalq layihələr, əcnəbi tələbələrlə işin təşkili haqqında məlumat verib. Bildirib ki, Avropa Birliyini birləşdirən və onun bütün sənədlərində təsdiqini tapmış 6 ümumi dəyəri - insan ləyaqəti, azadlıq, demokratiya, bərabərlik, qanunun aliliyi, insan hüquqlarına, o cümlədən azlıqların hüquqlarına hörmət dəyərlərini inklüziv təhsil, mədəniyyətlərarası səriştə (multikulturalizm), sosial birlik, elmdə tənqidi düşüncə, fəal vətəndaşlıq, media savadlılığı vasitəsilə əhatə etmək olar. Azərbaycanda öyrətmə və öyrənmə prosesində bu dəyərlərin tətbiq edilməsi istiqamətində mühüm işlər həyata keçirilib. Təhsil Nazirliyinin xətti ilə həyata keçirilən islahatlar, o cümlədən "Azərbaycan ali təhsil sisteminin gücləndirilməsinə dəstək" Tvinninq layihəsi, inklüziv təhsilə dair "Müəllimlərin



inklüziv təhsil sahəsində bacarıqlarının artırılması" və "Azərbaycanda əlilliyi olan uşaqlar üçün keyfiyyətli inklüziv təhsilin genişləndirilməsi" layihələrinin sadalanan ümumi dəyərlərin geniş yayılmasında əhəmiyyətli rol oynayacağını vurğulayıb. Qeyd edib ki, şagirdlərin mənəviyyatının formalaşmasında heç nə müəllimin davranışı qədər əhəmiyyətli rol oynaya bilməz.

Sessiyanın sonunda reportaj hazırlayan müşahidəçi, Latviyanın Erasmus+ Milli Agentliyinin təmsilçisi Antra Mengele sessiyanın yekunlarına dair qısa arayış verərkən bu istiqamətdə Azərbaycanda həyata keçirilən tədbirlərin olduqca maraqlı olduğunu və ölkəmizin təcrübəsinin digər ölkələr üçün nümunə olduğunu bildirib. Daha sonra çıxışını tamamlayan müşahidəçi Nigar Abbaszadədən sitat gətirərək, gənc nəslin tərbiyəsində müəllimlərin roluna xüsusi toxunub.

# Məzun Gününə həsr edilmiş tədbir

**İyunun 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Məzun Gününə həsr edilmiş tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, professor-müəllim heyəti və məzunların valideynləri iştirak ediblər. Tədbirdə əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.**



Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov məzunları və onların valideynlərini bu əlamətdar və xoş gün münasibətilə təbrik edib, məzunlara gələcək həyatlarında və müqəddəs müəllimlik fəaliyyətlərində uğurlar arzulayıb, onların gələcəkdə müstəqil ölkəmizin hərtərəfli inkişafına öz layiqli töhfələrini verəcəklərinə əminliyini ifadə edib.

Rektor Cəfər Cəfərov qeyd edib ki, müəllimlik şərəfli, müqəddəs, eyni zamanda məsuliyyətli peşədir. Müasir Azərbaycanın qurucusu, ümummilli liderimiz Heydər Əliyev demişdir: "Mən Yer üzündə müəllim adından yüksək ad tanımıram".



Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev demişdir: "Təhsil hər bir dövlətin gələcəyidir. Bizim gənclərimiz bilikli, peşəkar və vətənpərvər olmalıdırlar. Bu amillərin sintezi ölkəmizin gələcək uğurlu inkişafını şərtləndirəcəkdir".

Azərbaycan Respublikasının Birinci vitse-prezidenti hörmətli Mehriban xanım Əliyeva demişdir: "Əsas hədəfimiz savadlı və müasir düşüncəli gəncliyin yetişməsidir".

Rektor bildirib ki, bu il ADPU-nu 8 fakültə üzrə əyani təhsilalma forması üzrə 2193 nəfər, 7 fakültə üzrə qiyabi təhsilalma forması üzrə isə 136 nəfər -ümumilikdə 2329 nəfər məzun bitirir. Builki tədris ilində universitetin magistraturasını 16 ixtisas, 18 ixtisaslaşma üzrə 388 nəfər magistr, SABAH qruplarını 1 ixtisas üzrə 30 nəfər məzun, ali təhsilin bakalavriat səviyyəsi üzrə 3 ixtisas üzrə 35 nəfər, magistratura səviyyəsi üzrə isə 2 ixtisas üzrə 9 nəfər-ümumilikdə 44 nəfər əcnəbi məzun, Davamlı təhsil və təlim şöbəsini 8 ixtisas üzrə 162 nəfər dinləyici bitirir. Builki tədris ilində ADPU-nun Ağcabədi Filialını əyani təhsilalma forması üzrə 7 ixtisas üzrə 144 nəfər, Cəlilabad Filialını əyani təhsilalma forması üzrə 4 ixtisas üzrə 102 nəfər, Şəki Filialını əyani təhsilalma forması üzrə 8 ixtisas üzrə 254 nəfər, Şamaxı Filialını əyani təhsilalma forması üzrə 5 ixtisas üzrə 127 nəfər, Quba Filialını əyani təhsilalma forması üzrə 6 ixtisas üzrə 175 nəfər məzun bitirir. Ümumilikdə bu il ADPU-nun 5 filialını 802 nəfər məzun bitirir. ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci (ADPK) isə 7 ixtisas üzrə əyani təhsilalma forması üzrə 846 nəfər məzun bitirir. Bütövlükdə bu il ADPU-nu filiallar və ADPK ilə birlikdə 4601 nəfər məzun bitirir.

Rektor çıxışında vurğulayıb ki, son illər ölkəmizdə müəllim peşəsinin ictimai nüfuzunun yüksəldilməsi istiqamətində mühüm tədbirlər həyata keçirilir. Azərbaycan Prezidenti İlham Əliyev müəllim adına, müəllim əməyinə yüksək qiymət verir, müəllimlərin sosial müdafiəsinin gücləndirilməsi və onlara dövlət qayğısının artırılması üçün ardıcıl addımlar atılır. Ölkə Prezidentinin "Dövlət ümumi təhsil müəssisələrində çalışan, bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi aparılan müəllimlərin əməkhaqqının artırılması haqqında" və "Dövlət peşə təhsili müəssisələrində çalışan, bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi aparılmış müəllimlərin, idarəetmə və təlim fəaliyyəti ilə məşğul olan işçilərin əməkhaqlarının artırılması haqqında" 18 iyun 2019-cu il tarixli sərəncamları ilə onların aylıq vəzifə maaşlarının sentyabrın 1-dən orta hesabla 20 faiz artırılması bunu bir daha təsdiqləyir.

Çıxışının sonunda rektor məzungənclərə elmin sürətlə inkişaf etdiyi müasir dünyamızda elmi yenilikləri dərindən öyrənməyi, əldə etdikləri bilik və bacarıqları artırmağı, müasir düşüncəli gənclər kimi formalaşmağı, fəal və ləyaqətli vətəndaş olmağı, milli-mənəvi dəyərlərimizi yüksək tutmağı, dövlətə və dövlətçiliyə sədaqətlə xidmət etməyi tövsiyə edib.

Sonra təhsildə, ictimai fəaliyyətdə və idmanda xüsusi fərqlənən məzunlara fəxri fərmanlar təqdim edilib.

Tədbir tələbələrin,gənc müğənnilərin və tanınmış incəsənət ustalarının hazırladıqları konsert proqramı ilə davam edib.

Sonda xatirə şəkli çəkdirilib.



# Fizika və texnologiya fakültəsinin Elmi Şurasının iclası

İyunun 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsinin Elmi Şurasının növbəti iclası keçirilib. İclasda Elmi Şuranın 18 nəfər üzvündən 16 nəfər iştirak edib. Elmi Şuranın iclasında ADPU-nun Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev və universitetin baş hüquqşünası Zakir Nağıyev müşahidəçi qismində iştirak ediblər.





İclasda əvvəlcə fakültənin dekanı, Elmi Şuranın sədri, dosent Arzu Daşdəmirov gündəlikdə duran əsas məsələ - "Kafedralarda vakant müəllim, baş müəllim, dosent və professor vəzifələrinə seçki" barədə çıxış edib.

İclasda Elmi Şuranın katibi, dosent Xatirə Adıgözəlova iddiaçılar barədə ətraflı məlumat verib. Dosent X. Adıgözəlova hər bir iddiaçı haqqında kafedraların əsaslandırılmış rəyini Elmi Şura üzvlərinin diqqətinə çatdırıb. Sonra hər kafedradan 1 nəfər olmaqla, 3 nəfərdən ibarət Hesablama Komissiyası yaradılıb: dosent Xankişi Məmmədov - sədr, professor Həmzə Seyidli- üzv və baş müəllim Gülşən Musayeva - üzv.

Daha sonra gizli səsvermə keçirilib. Fizikanın tədrisi metodikası kafedrasında İsa İsmayılov 16 səslə, Əfqan Kərimov 16 səslə, Dilbər Əliyeva 9 səslə, Ümumi fizika kafedrasında Namiq Niftiyev 13 səslə, Asəf Nəbiyev 16 səslə, Texnologiya və onun tədrisi metodikası kafedrasında Arif Mustafayev 15 səslə, Qaçay Əliyev 15 səslə, Ədalət Quliyev 14 səslə, Əsbət Teymurova 13 səslə, Qabil İsayev 11 səslə uyğun vəzifələrə seçiliblər. Ümumi fizika kafedrasında 1 dosent yerinə, Fizikanın tədrisi metodikası kafedrasında isə 1 baş müəllim yerinə seçilən olmadığına görə həmin yerlər vakant qalıb.

Seçkinin keçirilməsi ilə bağlı müşahidəçilər-Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent V. Əliyev və universitetin baş hüquqşünası Z.Nağıyev çıxış edərək seçkinin şəffaf, ədalətli və obyektiv keçirildiyini vurğulayıblar.

Sonda Fizika və texnologiya fakültəsinin dekanı, dosent A.Daşdəmirov qalib gələnləri təbrik edərək onlara uğurlar arzulayıb.

# "Saf düşüncə möcüzə yaradır" mövzusunda Humanist Pedaqogika üzrə III Respublika oxuları

İyunun 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) və Azərbaycan Respublikasının Humanist Pedaqogika Mərkəzinin birgə təşkilatçılığı ilə universitetdə "Saf düşüncə möcüzə yaradır" mövzusunda Humanist Pedaqogika üzrə III Respublika oxuları keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, Təhsil Nazirliyinin məsul şəxsləri, Bakı Dövlət Universitetinin (BDU) Psixologiya kafedrasının müdiri, professor, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) müxbir üzvü, Milli Məclisin Elm və təhsil komitəsinin sədr müavini Bəxtiyar Əliyev, Dövlət Gömrük Komitəsinin Akademiyasının rəisi, hüquq üzrə fəlsəfə doktoru, dosent, "Humanist pedaqogika cəngavəri" ordenli Qulu Novruzov, AMEA-nın Fəlsəfə və Hüquq İnstitutunun Sosiologiya və sosial psixologiya şöbəsinin müdiri, professor, Əməkdar elm xadimi Rəfiqə Əzimova, Humanist Pedaqogika üzrə Təhsil Müəssisələrinin Beynəlxalq Assosiasiyasının prezidenti, Əməkdar müəllim, "Humanist pedaqogika cəngavəri" ordenli Asif Cahangirov, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin, Sumqayıt Şəhər Təhsil Şöbəsinin, Abşeron Rayon Təhsil Şöbəsinin təmsilçiləri, ADPU-nun Şamaxı Filialının əməkdaşları, Qobustan rayonunun təhsil nümayəndələri, bir çox orta məktəblərin direktorları, müavinləri və müəllimləri, məktəbəqədər təhsil müəssisələrinin müdirləri, tərbiyəçiləri, tanın□mış alimlər iştirak ediblər. Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlayıb.

Tədbiri ADPU-nun rektoru, professor, "Humanist pedaqogika cəngavəri" ordenli



Cəfər Cəfərov giriş sözü ilə açaraq bildirib ki, "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"na uyğun olaraq təhsilin yeni məzmununun reallaşdırılması və mənəvi-əxlaqi dəyər□lərin məzmuna tətbiqi üçün bir sıra tədbirlər həyata keçirilir. Belə ki, 1-4 dekabr 2014-cü il tarixində Təhsil Nazirliyinin dəstəyi ilə Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutu tərəfindən "Mənəvi-əxlaqi tərbiyə şəxsiyyətin hərtərəfli inkişafının əsasıdır" mövzusunda I elmi-praktik konfrans və seminar keçiril□ib. Bu tədbirin davamı olaraq 21-25 dekabr 2016-cı il tarixində ADPU-nun, ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin və Azərbaycan Respublikasının Humanist Pedaqogika Mərkəzinin birgə təşkilatçılığı ilə "Təhsildə mənəvi-əxlaqi dəyərlər: harmonik şəxsiyyətin inkişafı" mövzusunda II beynəlxalq konfrans-seminar və I Respublika oxuları keçirilib. 2018-ci il martın 23-də ADPU-da "Beynəlxalq Assosiasiya" İctimai Birliyinin Humanist Pedaqogika Beynəlxalq Mərkəzinin, ADPU-nun və Azərbaycan Respublikasının Humanist Pedaqogika Mərkəzinin birgə təşkilatçılığı və Oxuların müəllifi, müasir pedaqogikanın əfsanəsi, Beynəlxalq Humanist Pedaqogika Mərkəzinin fəxri prezidenti, Rusiya Təhsil Akademiyasının aka-



demiki, Rusiya Federasiyası Hökumətinin təhsil sahəsində iki dəfə mükafatçısı, psixologiya elmləri doktoru, professor, yazıçı Şalva Amonaşvilinin iştirakı ilə "Ailə insan mədəniyyətinin beşiyidir" mövzusunda Humanist Pedaqogika üzrə 3 günlük XVII Beynəlxalq oxuları keçirilib. Qeyd edək ki, oxularda respublikamızın və xarici ölkələrin humanist pedaqogika sahəsində çalışan tanınmış və nüfuzlu 320 nəfər alim-mütəxəssisi, gənc müəllimlər iştirak edib və bu oxuları möhtəşəm və təkrarsız bir tədbir kimi qiymətləndiriblər. 2018-ci il iyunun 2-də ADPU-nun Şamaxı Filialında 8 regionun 250 nəfər pedaqoji kadrının cəlb olunduğu Humanist Pedaqogika üzrə II Respublika oxuları keçirilib. Bu tədbirlərdə təhsilin, təlim-tərbiyənin nəzəri, metodoloji əsasları, innovativ texnologiyalar, təhsilin yeni məzmunu, ailə və cəmiyyətin, digər sosial institutların tərbiyə prosesində rolunun artırılması yolları müzakirə edilib, yüzlərlə pedaqoji kadra müvafiq mövzularda yeni bilik və bacarıqlar aşılanıb. Bu tədbirlərin davamı olaraq, bu gün "Saf düşüncə möcüzə yaradır" mövzusunda Humanist Pedaqogika





üzrə III Respublika oxuları keçirilir.

AMEA-nın müxbir üzvü, Milli Məclisin Elm və təhsil komitəsinin sədr müavini, professor Bəxtiyar Əliyev ölkədə təhsil sa-



həsində aparılan islahatların uğurlu nəticələrindən danışıb. Qeyd edib ki, Azərbaycanda təhsilin inkişafına xüsusi önəm verilir. Artıq təhsillə bağlı qanunvericilik bazası möhkəmləndirilib. Bu qanunvericilikdə bütövlükdə təhsil sistemi, o cümlədən məktəbəqədər, orta, peşə, ali təhsil məsələləri öz əksini tapıb.



Təhsil Nazirliyinin Təhsilin inkişafı proqramları şöbəsinin müdiri Emin Əmrullayev təhsil sahəsində tətbiq olunan yeniliklərdən danışıb. Təhsil sistemində dəyişikliklərin labüd olduğunu deyən E.Əmrullayev bu sahədə informasiya-kommunikasiya texnologiyalarının inkişafının rolundan, virtual təhsil sisteminin üstünlüklərindən danışıb. Qeyd edib ki, Azərbaycanda elmin bir sahəsi kimi humanist pedaqogikanın tədrisdə rolu danılmazdır. Humanist pedaqogika sahəsində keçirilən oxuları yüksək qiymətləndirən E.Əmrullayev konfransın əhəmiyyətini vurğulayaraq deyib ki, belə oxular ölkəmizdə artıq ənənəyə çevrilib. Bu istiqamətdə həm beynəlxalq, həm də respublika səviyyəsində müxtəlif tədbirlər keçirilir. Bu sevindirici haldır və pedaqoji ictimaiyyət üçün mühüm töhfədir.

Dövlət Gömrük Komitəsinin Akademiyasının rəisi Qulu Novruzov, Bakı Humanitar Kollecinin direktor müavini, Humanist Pedaqogika üzrə Təhsil Müəssisələrinin Beynəlxalq Assosiasiyasının İdarə Heyətinin üzvü, "Humanist pedaqogika cəngavəri" ordenli Afaq Əliyeva, Əməkdar müəllim, "Humanist pedaqogika cəngavəri" ordenli Asif Cahangirov və digər çıxış edənlər təhsil sahəsində tətbiq olunan humanist pedaqogikanın mahiyyətindən danışıblar.

Konfransda son illər ölkəmizdə humanist pedaqogika sahəsində həyata keçirilən tədbirlərlə bağlı videoçarx nümayiş etdirilib, humanist pedaqogikanın himni səsləndirilib.

Sonra tədbir A.Əliyevanın moderatorluğu ilə davam edib. ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov "Düzgün düşünmək böyük bir kəşf qədər əhəmiyyətlidir" mövzusunda, Azərbaycan Respublikası Təhsil İnstitutunun Psixologiya və yaş fiziologiyası şöbəsinin müdiri, professor Elxan Bəylərov "Dəyərlərin dilemması" mövzularında çıxış ediblər, həmçinin təcrübəli pedaqoq-alimlər tərəfindən ustad dərsləri keçirilib.

Sonda tədbir iştirakçılarına sertifikatlar təqdim olunub.

# 204 nömrəli tam orta məktəbdə professor Zahid Xəlillə görüş

İyunun 13-də Bakı şəhəri, Xətai rayonu, 204 nömrəli tam orta məktəbin 3 c sinfində Azərbaycan Dövlət Pedaqoji Universitetinin Filologiya fakültəsinin Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının professoru, filologiya üzrə elmlər doktoru, Əməkdar müəllim Zahid Xəlillə görüş keçirilib. Qeyd edək ki, uşaq ədəbiyyatı üzrə müasir Azərbaycan ədəbiyyatının ən parlaq nümayəndəsi ilə keçirilən görüş məktəb kollektivi tərəfindən yüksək qiymətləndirilib.

Görüş zamanı 3c sinfinin şagirdləri tərəfindən şairin "Güzgü" əsəri səhnələşdirilib, müxtəlif şeir və hekayələri səsləndirilib. Şagirdlərin maraqlı sualları professor Z.Xəlil tərəfindən cavablandırılıb.

Məktəbin direktoru Ziba Rzayeva və sinif rəhbəri Aytən Zeynalova çıxış edərək şagirlərin mənəvi tərbiyəsində mühüm rol oynayan belə görüşlərin müntəzəm keçirilməsinin vacibliyini vurğulayıblar.

Sonda məktəblilərin sevimli yazarı olan professor Z.Xəlil çıxış edərək məktəbin rəhbərliyinə öz təşəkkürünü bildirib və belə görüşləri onun yaradıcılığına verilən yüksək dəyər kimi qiymətləndirib. Professor Z.Xəlil növbəti dərs ilində



məktəbin bütün kollektivi ilə görüşəcəyini bildirib.

Professor Z.Xəlillə xatirə şəkli çəkdirilib.

**Vaqif İsrafilov-60**

# Müəllim-alim ömrünün dəyərləri

Hər ikimiz Borçalıdan, hətta eyni rayondan və qonşu kənddən olsaq da, Vaqif İsrafilovla tələbəlik illərində Bolqarıstan Respublikasında tanış olmuşuq. O, Azərbaycan Pedaqoji İnstitununun (indiki ADPU), mən isə A.S.Puşkin adına Tbilisi Dövlət Pedaqoji İnstitutunun tələbə heyətinin tərkibində 1981-ci ildə Bolqarıstanda əmək semestrində iştirak etmişik. Bu ölkənin Blaqoyevoqrad şəhərində keçirilən əmək semestrində bizdən başqa Rumıniya, Çexoslavakiya (indiki Çexiya və Slovakiya Respublikası), Polşa və digər ölkələrdən gəlmiş tələbələr də var idi. Hələ o vaxtlar, belə desək,erkən gənclik illərində Vaqif İsrafilov tezliklə müxtəlif ölkələrdən gəlmiş tələbələr arasında, tamam yad bir mühitdə hörmət qazanmağı, özünün müsbət aurası və keyfiyyətləri ilə tələbələrlə gözəl ünsiyyət qurmağı, qısa müddət ərzində dostlarının əhatə dairəsini genişləndirməyi bacardı.

Məlumdur ki, həyatda hər bir kəsin özünəməxsus ömür payı var. İnsan bu ömür yolunu elə keçməlidir ki, tanıyanlar və tanımayanlar onun əməllərindən, gördüyü xeyirxah işlərdən səmimiyyətlə söhbət açsınlar, onu hörmətlə yad etsinlər. V. İsrafilov öz ömür yolunu elmə, təhsilə bağladı. O, yaxşı bilirdi ki, bu yolda uğur qazanmağın əsasını istedad, bilik, savad, ziyalı mədəniyyəti, davranışı, əxlaqi keyfiyyətlər təşkil edir. Bu nəcib keyfiyyətlərə malik olmayan insanın uğur qazanacağı şübhə doğurur. Ona görə də, V.İsrafilov, arzusuna çatmaq üçün həyata qədəmlərini cəsarətlə atıb, məqsədi uğrunda cəsarətlə mübarizə aparıb. Nahaq deməyiblər ki, halal əmək, zəhmət yerdə qalmaz. Tezliklə öz istedadı, təbiiliyi, səmimiyyəti ilə kollektivdə nüfuz və hörmət qazanmağa başlayıb, istənilən adamla ünsiyyət qurmağa nail olub.

V.İsrafilov 1982-ci ildə ADPU-nu bitirdikdən sonra təyinatla Cəlilabad rayonunun Novoqalovka kənd orta məktəbində Azərbaycan dili və ədəbiyyatı müəllimi işləyib. 1986-cı ildə ADPU-nun dissertantı (Azərbaycan dilçiliyi kafedrasında) olub, 1989-cu ildə "Azərbaycan ononim və hidronimlərinin Gürcüstan arealı" mövzusunda namizədlik dissertasiyası müdafiə edərək filologiya elmləri namizədi alimlik (indi filologiya üzrə fəlsəfə doktoru) dərəcəsi alıb. Dörd il (1986-1990-cı illər) Bakı şəhəri 42 №-li texniki-peşə məktəbində ixtisası üzrə müəllim işləyib. 1990-cı ildən taleyini ADPU ilə bağlayıb. Bu ali təhsil müəssisəsində laborant vəzifəsində əmək fəaliyyətinə başlayan V.İsrafilov hazırda Azərbaycan dilçiliyi kafedrasının dosentidir. O, 5 kitab, 4 proqram, 100-dən çox tezis və elmi məqalənin müəllifidir. Onlarla dərslik və monoqrafiyanın rəyçisi və ya redaktoru olub. Filologiya üzrə fəlsəfə doktoru alimlik dərəcəsi almaq üçün yazılmış iki dissertasiya işinə opponentlik edib. Dəfələrlə Türkiyədə, İranda, Rusiyada elmi konfransların iştirakçısı olub, Təhsil Nazirliyinin fəxri fərmanı ilə təltif edilib.



Dərin zəkaya, özünəməxsus ziyalı mədəniyyətinə, yüksək insani keyfiyyətlərə, mədəni səviyyəyə, ünsiyyət qurmaq bacarığına malik olan V. İsrafilov insanlara, kollektivə tez qaynayıb-qarışması ilə seçilən ziyalılardandır. Onun bu xüsusiyyətləri ilk andan diqqəti cəlb edir və bu özünəməxsusluq da onun uğurlarına təkan verir.

İstedadlı müəllim-alim kimi tanınan V. İsrafilov auditoriyada tədris etdiyi fənlərin incəliklərini tələbələrə məharətlə aşılayır, bu fənləri tələbələrə sevdirməyi bacarır. Bu da onun yüksək pedaqoji mərifət sahibi olduğuna dəlalət edir. Görkəmli rus pedaqoqu K.D.Uşinski demişdir: "Tərbiyəçi pedaqogikanın nəzəriyyəsini nə qədər yaxşı öyrənmiş olsa da, pedaqoi mərifəti olmayınca heç vaxt yaxşı təcrübəçi-tərbiyəçi olmayacaqdır". V.İsrafilovu da tələbələrə ən çox sevdirən, ona böyük hörmət qazandıran da hər şeydən əvvəl, məhz yüksək mənəvi keyfiyyətləri, pedaqoji mərifətidir. O, çox iş görsə də, yerliyersiz özünü gözə soxmağa çalışmır. Bacarmadığı işə meyil göstərmir,ona tapşırılan işi isə həmişə ləyaqətlə yerinə yetirir. İşləməkdən, çalışmaqdan usanmır, əksinə, həmin işi şərəflə yerinə yetirməyə çalışır, bunu özünün vətəndaşlıq və ziyalı borcu hesab edir.

V.İsrafilov ölkəmizin ictimai-siyasi həyatında da fəallığı ilə seçilir. O, Yeni Azərbaycan Partiyasının üzvüdür. I, II və III çağırış Binəqədi rayon Binəqədi Bələdiyyəsinə üzv seçilib. Hazırda da həmin bələdiyyədə daimi komissiyanın sədridir. Bu sahədə də V.İsrafilov fəal ictimaiyyətçi kimi tanınıb, öz səmərəli fəaliyyəti ilə rayon ictimaiyyətinin rəğbətini qazanıb.

Azərbaycan dövlətçiliyinin qurulmasında və inkişafında böyük xidmətləri olan ulu öndər Heydər Əliyevin şəxsiyyətini və fəaliyyətini Vaqif İsrafilov həmişə yüksək qiymətləndirib. Azərbaycan xalqının böyük oğlu Heydər Əliyev haqqında 2006-cı ildə "Şəxsiyyətin möcüzəsi" sərlövhəli qiymətli kitab yazıb. Kitabda Ulu Öndərin Azərbaycan dövlətinin və xalqının tarixində göstərdiyi misilsiz xidmətlərdən söhbət açıb, bu dahi şəxsiyyətin əbədiliyi haqqında qiymətli fikirlər söyləyib.

Dövlət və dövlətçiliyə sadiq bir ziyalı, sədaqətli dost, xeyirxah və qayğıkeş insan olan V. İsrafilov həm də gözəl ailə başçısıdır. Valideyn-övlad münasibətlərindən söz düşəndə həmişə O.Balzakın bir fikri yada düşür: "Atalar həmişə öz atalıq səadətlərindən feyz almalıdırlar. Atanın vəzifəsi həmişə verməkdir, almaq deyil". V.İsrafilov iki qız övladının atasıdır. Onların səadəti və xoşbəxtliyi üçün bütün çətinliklərə sinə gərib, hər ikisinə ali təhsil verib, gələcəklərinə böyük ümidlə baxıb. Övladları da valideynlərinin ümidlərini doğruldub, biri həkimlik, digəri isə müəllimlik peşəsini seçiblər. Hazırda hər ikisi ixtisasları üzrə çalışırlar.

V.İsrafilov ADPU-nu həmişə öz doğma evi bilib. Alim, müəllim və vətəndaş kimi öhdəsinə düşən vəzifəni böyük məsuliyyət hissi ilə yerinə yetirib.

Həssaslığı ilə seçilən, hamı tərəfindən sevilən, qəddi-qamətli, həmişə vüqarlı, sadə, səmimi, təbii ziyalı olan V.İsrafilova möhkəm cansağlığı, yeni-yeni yaradıcılıq uğurları arzulayıram.

**Razim Məmmədov,**
**Azərbaycan və dünya ədəbiyyatı kafedrasının müdiri, dosent**

***Dosent Vaqif İsrafilovun 60 illik yubileyinə***

## Vaqif

Arakol kəndindən altmış il əvvəl
"Xoş gəldim!" sədalı bulaqdır Vaqif!
İsrafil, İsmayıl məbədgahında
Tanrıdan şəfəqli ocaqdır Vaqif!

Aslan meydanında hallanır adı,
Əzəmət coşdurur yaxını, yadı,
İki övladıdır qoşa qanadı,
Nəvələrə isti qucaqdır Vaqif!

Qəlbində elinə sevgi çağlayır,
Dili Borçalıya dastan bağlayır,
Pəhləvan cüssəsi yağı dağlayır,
Sədaqət nəğməli dodaqdır Vaqif!

Kürdən paklıq alıb, dağlardan vüqar,
Gül üzünü görsə, durulur sular,
Şərin, bəd əməlin qəsdinə durar,
Fitnədən, fəsaddan uzaqdır Vaqif!

Dilçilik elmini yaşadan nəfəs,
Uca Haqdan gəlir ona bu həvəs.
Tapıb təsdiqini ilahi bir səs:
-"İrfan aləmində çıraqdır Vaqif!"

Sevin, Binəqədi bələdiyyəsi,
Gəlib bu quruma bal hədiyyəsi!
Gəlib söz sahibi, nüfuz yiyəsi,
Ədalət nurundan soraqdır Vaqif!

Üzündəki nurundan Ay, Ulduz çaşar,
Dilindəki istək qəlbində daşar,
İnşaallah, pak ömrün yüzü də aşar,
Altmış bu gününə qovaqdır, Vaqif!

**Məhərrəm Hüseynov,**
**filologiya üzrə elmlər doktoru, professor**

# Siyasi inkişaf və mədəniyyətlərarası dialoq üçün vacib platforma

Cəmi 28 illik müstəqillik tarixinə baxmayaraq, Azərbaycan bir sıra sahələrdə, o cümlədən humanitar forumların yüksək səviyyədə təşkilində və keçirilməsində nümunəvi dövlətə çevrilib. 2008-ci ildən Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin təşəbbüsü ilə həyata keçirilən "Bakı prosesi" bu müddət ərzində qarşılıqlı hörmətə əsaslanan fikir mübadiləsinin yaradılması üçün körpü rolunu oynayıb. Son 11 ildə ölkəmizdə keçirilən mədəniyyətlər və sivilizasiyalararası dialoqlar öz coğrafiyasını daha da genişləndirərək, Latın Amerikası ölkələrindən tutmuş Səudiyyə Ərəbistanı, Böyük Britaniya kimi dövlətləri əhatə edir. Bakıda keçirilən "Ayrı-seçkilik, zoraki münaqişəyə qarşı fəaliyyət naminə dialoq quraq" şüarı altında V Ümumdünya Mədəniyyətlərarası Dialoq Forumu da bunu təsdiqlədi.

2019-cu il may ayının 2-3-də Bakı şəhərində V Ümumdünya Mədəniyyətlərarası Dialoq Forumu keçirilib. Bu forum "Ayrı-seçkilik, qeyri-bərabərlik və zoraki münaqişəyə qarşı fəaliyyət naminə dialoq quraq!" şüarı altında təşkil olunmuşdu. Forum çox zəngin proqrama malik olub öz əhəmiyyəti ilə seçilmişdir.

Forumda "Müxtəlifliyin idarə olunması: çoxsəviyyəli və çoxtərəfli əməkdaşlıq", "Sülh naminə gənclər: şiddətli ekstremizmə qarşı əks qüvvənin formalaşdırılması" və "Miqrasiya, yerdəyişmə və insan təhlükəsizliyi" mövzularında üç əsas plenar sessiya keçirilmişdir. Dünyada sülh və bərabərliyin ,qarşılıqlı etimadın və anlaşmanın əldə olunmasında bu tədbirin böyük əhəmiyyəti olmuşdur.

Birinci dəfə Bakı Ümumdünya Mədəniyyətlərarası Dialoq Forumu 40 ölkə ilə işinə başlasa da, keçən müddət ərzində öz əhatə dairəsini genişləndirib və builki forumda 135 ölkənin ictimai-siyasi xadimləri iştirak ediblər. Forum müddətində çoxsaylı məruzələr, 20-dən çox müxtəlif tədbirlər, o cümlədən sessiyalar, dəyirmi masalar və başqa tədbirlər təşkil edilib.

30-dan çox beynəlxalq təşkilat rəhbərləri dünya əhalisini narahat edən məsələləri müzakirə edərək çıxış yollarını göstəriblər. Bakı Forumunda keçirilən sessiyalar canlı şəkildə BMT-nin vebsaytı vasitəsilə yayımlanıb.

Mayın 3-də V Umumdünya Mədəniyyətlərarası Dialoq Forumu çərçivəsində "Gənclər sülh naminə: şiddətli ekstremizmə qarşı əks qüvvənin formalaşdırılması" mövzusunda ikinci plenar sessiya keçirilib. Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla Əliyeva sessiyada iştirak edib.

BMT-nin Sivilizasiyalar Alyansı üzrə Ali nümayəndəsi Migel Anxel Moratinosun moderatorluğu ilə keçirilən sessiyada Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla Əliyeva çıxış etdi. O, gənclərə müraciətlə çıxış edərək qeyd edib ki, təhsil yalnız bilik və peşəkar inkişaf bacarıqlarının qazanılması deyil. Həmçinin mənəvi təhsil də bunlar qədər vacibdir. Bu baxımdan ailələr və məktəblər iki mühüm təsisatdır. Əməkdaşlıq, anlaşma və bütün bəşəriyyətə rəğbət və hörmət dəyərləri aşılayan ailə uşaqları sülhpərvər dünyaya hazırlamaqda mühüm rol oynayır. Bunlar olmayanda boşluğu nifrət və dözümsüzlük doldurur. Eyni zamanda gənclərə doğru-düzgün təhsil vermək onların tam potensialının reallaşması üçün çox vacib bir amildir. Çünki gənclərin tez öyrənmək, eləcə də prosesləri izləmək, çoxsaylı məlumatları əldə etmək kimi bacarıqları var. Həmçinin onlar ətraf mühitin mühafizə olunması və təbiətin bizə bəxş etdiyi nemətlər barədə çox məlumatlıdırlar.

İşgüzar şəraitdə keçən forumda sülh və inkişafa nail olmaq məqsədilə mədəniyyətlərarası anlaşma və mədəni müxtəliflik məsələləri, qloballaşma dövründə mədəniyyətlərin qarşılıqlı təsiri və sintezi, sürətlə dəyişməkdə olan dünyada sivilizasiyalararası əlaqələrin əhəmiyyəti və etnik münaqişələrin qarşısının alınması, turizmin inkişafı və digər məsələlər müzakirə olunub.

V Ümumdünya Mədəniyyətlərarası Dialoq Forumu çərçivəsində keçirilən sessiyalardan biri də "Türkdilli ölkələr arasında dialoqun qurulmasında Böyük İpək Yolunun rolu" mövzusunda olmuşdur. Forumda iştirak edən müxtəlif ölkələrin elm və mədəniyyət xadimləri, siyasətçiləri, din xadimləri səmərəli müzakirələr aparıblar.

Əsrlər Boyu İpək Yolu, sadəcə, dəyərli əşyalar gətirən karvanlar üçün bir yol deyil, həm də mədəniyyət, fikir mübadiləsi üçün bir vasitə olub. Bu mövzu elə indi də öz aktuallığını qoruyub saxlayır. Çünki tarix boyu ticarət və mədəniyyət, eləcə də ünsiyyətin artımı üçün xidmət edən İpək Yolu yenidən canlanır. Uzaq Çindən Orta Asiya ölkələrinədək, Anadolu və Aralıq dənizi üzərindən Avropaya uzanan, Şərqlə Qərbi birləşdirən bu möhtəşəm yol həm də xalqları birləşdirir. Böyük İpək Yolu həmişə türkdilli xalqları bir araya gətirən mədəni, tarixi əlaqələrdən biri olub. Buna səbəb onun iqtisadi əhəmiyyəti ilə yanaşı, mədəni-ticari proseslər idi. Tacirlər bu böyük materiklər üzərində hərəkət edərkən, sadəcə əşya, geyim, nadir incəsənət nümunələri daşımayıblar. Onlar həmçinin mədəniyyəti, dili, dini ayinləri, adət-ənənələri, fərqli mətbəxləri və daha bir çox rəmzləri daşıyıblar. Bir sözlə, qədim İpək Yolu tolerantlığın, humanizmin, mərhəmətin əsas vasitələrindəndir.

Tədbirdə Türk Şurasının Baş katibinin müavini Qismət Gözəlov, TÜRKSOY-un Baş katibi Düsen Kaseinov, İslam Tarixi, İncəsənət və Mədəniyyəti Araşdırma Mərkəzinin (IRCICA) Baş direktoru Halit Eren, Macarıstanın Türkdilli Dövlətlərin Əməkdaşlıq Şurasının səfiri, türkoloq Janos Hovari, UNESCO-nun Türkiyə Milli Komissiyasının sədri Mehmet Öcal Oğuz, Moldova Milli Komissiyasının UNESCO üzrə Baş katibinin müavini Luminita Drumea, Avrasiya Yazarları Birliyinin sədri Yakub Ömeroğlu, yazıçı Kemal Salli, macar türkoloq Cecilia Hazai, "Murad Adci" saytının Baş redaktoru Marina Kuriachaia-Adci və başqaları türkdilli ölkələrin müxtəlif sahələr üzrə əməkdaşlığından və Böyük İpək Yolunun xalqlar arasında dialoqun qurulmasında və qarşılıqlı əlaqələrin gücləndirilməsində rolundan bəhs ediblər.

Sonda Beynəlxalq Türk Mədəniyyəti və İrsi Fondu tərəfindən bir qrup şəxs mükafatlandırılıb.

Böyük Britaniyanın Kovent Universitetinin İnam, Sülh və Sosial Əlaqələr Mərkəzinin İcraçı direktoru, professor Mayk Hardi forumun yüksək səviyyədə təşkilinə görə Azərbaycan hökumətinə minnətdarlığını bildirib.

Tədbirin əhəmiyyətindən danışan alim deyib: "Forumun çox zəngin proqramı var. İki gün ərzində bizim müzakirə etdiyimiz məsələlər beynəlxalq əməkdaşlıq baxımından çox önəmli idi. Aparılan müzakirələr bizi yenidən bu məsələləri nəzərdən keçirməyə vadar edir. Dialoq çox önəmlidir. "Bakı prosesi" bir daha sübut edir ki, əməkdaşlıq əlaqələri möhkəmləndirilməlidir. Bu istiqamətdə birlikdə çalışmalıyıq".

Mayk Hardi dünyada sülh və bərabərliyin, qarşılıqlı etimadın və anlaşmanın əldə olunmasında bu tədbirin böyük əhəmiyyət kəsb etdiyini söyləyib.

Bağlanış mərasimində çıxış edən Mədəniyyət naziri Əbülfəs Qarayev bütün iştirakçılara və tərəfdaşlara minnətdarlığını bildirərək 2 gün ərzində mühüm mövzuların müzakirə olunduğunu bildirib.

Sonra BMT-nin Sivilizasiyalar Alyansı üzrə Ali nümayəndəsi Migel Anxel Moratinos, UNESCO-nun Baş direktorunun sosial və humanitar elmlər üzrə müavini Nada Al-Nəşif, ISESCO-nun Baş direktoru Əbdüləziz bin Osman əl-Tuveycri və BMT-nin Dünya Turizm Təşkilatının İcraçı direktoru Manuel Butler Halter çıxış edərək forumun yüksək səviyyədə təşkilinə görə Azərbaycan hökumətinə, xüsusilə də Prezident İlham Əliyevə minnətdarlıqlarını bildiriblər.

Qeyd edilib ki, forumda sülh və inkişafa nail olmaq məqsədilə mədəniyyətlərarası anlaşma və mədəni müxtəliflik məsələləri, qloballaşma dövründə mədəniyyətlərin qarşılıqlı təsiri və sintezi, sürətlə dəyişməkdə olan dünyada sivilizasiyalararası əlaqələrin əhəmiyyəti və etnik münaqişələrin qarşısının alınması, turizmin inkişafı və digər məsələlərə toxunulub. Həmçinin mədəni müxtəliflik üçün ictimai dəstəyin göstərilməsinə dair maraqlı təkliflər irəli sürülüb.

**Elman Mirzəyev,**
**tarix üzrə fəlsəfə doktoru**

# ADPU-nun Şamaxı Filialında yubiley tədbiri

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialında İctimai və xüsusi fənlər kafedrasının müdiri, dosent Mayıl Alıcanovun 80 illik yubi-**



**leyinə və elmi-pedaqoji fəaliyyətinin 60 illiyinə həsr olunmuş tədbir keçirildi.**

Tədbiri giriş sözü ilə açan filialın direktoru, dosent Tünzalə Yusifova Mayıl Alıcanovu yubiley münasibətilə təbrik



edərək onun həm filialda elmi-pedaqoji fəaliyyətindən, həm də rayon Ağsaqqallar Şurasının sədri kimi fəaliyyətindən danışdı. Çıxışının sonunda T.Yusifova M.Alıcanovu filialın rəhbərliyinin və Həmkarlar İttifaqı Komitəsinin Fəxri Fərmanı ilə təltif etdi.

Tədris və elmi işlər üzrə direktor müavini Şasəddin Mikayılov məruzə ilə çıxış edərək M.Alıcanovun həyat və yaradıcılığından danışdı.

Tədbirdə iştirak edən ADPU-nun Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev və Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vurğun Məmmədov M.Alıcanovu universitetin rektoru, professor Cəfər Cəfərovun adından və öz adlarından təbrik etdilər, ona ən xoş, ən gözəl arzularını bildirdilər. Sonra yubilyara rektor Cəfər Cəfərovun imzası ilə ADPU-nun Şamaxı Filialında uzun illər elmi-pedaqoji fəaliyyəti və 80 illik yubileyi münasibətilə, həmçinin Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin sədri Səttar Möhbalıyevin imzası ilə fəxri fərmanlar və mükafat təqdim etdilər.

Tədbirdə çıxış edən professor-müəllim heyəti M.Alıcanovu yubiley münasibətilə təbrik etdilər, ona uğurlar arzuladılar.

Sonda tələbələr adından çıxış edən "Tarix və coğrafiya müəllimliyi" ixtisasının tələbəsi Nərmin Maqsudova M.Alıcanovu təbrik etdi və tədbirdə iştirak edən tələbələr yubilyara gül dəstələri təqdim etdilər.

# ADPU-nun Quba Filialının təqdimat mərasimi

İyunun 12-də Quba Rayon Gənclər Mərkəzində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialının təqdimat mərasimi keçirilib. Təqdimat mərasimində filialın direktoru, professor Əli Allahverdiyev, Quba Rayon İcra Hakimiyyətinin (RİH) İctimai-siyasi və humanitar məsələlər şöbəsinin müdiri Tariyel İbrahimov, həmin şöbənin baş məsləhətçisi Anar Məmmədov, Quba Rayon Gənclər və İdman İdarəsinin müdiri Mustafa Nöhbalayev, Quba Rayon Təhsil Şöbəsinin (RTŞ) metodkabinet rəhbəri Namik Hümbətov, Quba şəhəri 1, 4, 5, 6, 7 nömrəli tam orta məktəblərin, Quba şəhəri Qırmızı qəsəbə 1 nömrəli tam orta məktəbin, Quba şəhər Texniki təmayüllü liseyin və Quba Rayonu Alekseyevka, I Nügədi kənd tam orta məktəblərinin müəllim və buraxılış sinif şagirdləri iştirak ediblər.



Təqdimat mərasimini açıq elan edən Quba RİH-in İctimai-siyasi və humanitar məsələlər şöbəsinin müdiri Tariyel İbrahimov ADPU-nun Quba Filialının təqdimatının keçirilməsinin abituriyentlər üçün əhəmiyyətindən danışıb və qeyd edib ki, bu təqdimat nəticəsində gənclər üçün yeni imkanlar açılır.



Tədbirdə çıxış edən filialın direktoru, professor Əli Allahverdiyev rəhbərlik etdiyi filialın tədris prosesi və fəaliyyət istiqamətlərindən danışıb. Bildirib ki, müasir təhsil modelini əsas tutaraq cəmiyyətə yüksək səviyyəli mütəxəssis və bu dövlət üçün ləyaqətli vətəndaş yetişdirən ADPU-nun Quba Filialı üçün keyfiyyətli təhsil əsas meyardır.

Sonra tədbirdə filialın Tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva ADPU-nun Quba Filialı haqqında slaydlarla ətraflı məlumat verib. Aysel Şeydayeva tədris olunan müxtəlif fənlər, filialdakı ixtisaslar barədə ətraflı məlumat verərək qeyd edib ki, filialda tələbələr üçün yüksək səviyyədə tədris şəraiti yaradılıb, dərslər İKT-nin müasir avadanlıqlarından istifadə etməklə aparılır.

Sonra tədbirdə filialın Ədəbiyyat və dillər kafedrasının baş müəllimi Eyvaz Şeydayev, Təbiət fənləri və onun tədrisi metodikası kafedrasının baş müəllimi Elbrus Əhmədov çıxış edərək filialda tələbə-gənclər üçün yaradılmış tədris şəraitindən, təhsilimizə göstərilən dövlət qayğısından, filialın pedaqoji və tələbə kollektivinin uğurlarından danışıblar.

Daha sonra tədbirdə Quba RTŞ-nin metodkabinetinin rəhbəri Namik Hümbətov çıxış edib və ADPU-nun Quba Filialının məzunu olaraq təhsilin əhəmiyyətindən, filialda yaradılan şəraitdən danışıb, müasir dövrdə filial rəhbərliyi tərəfindən yaradıcı və istedadlı gənclər üçün açılan imkanlar haqqında məlumat verib.

Sonda abituriyentləri maraqlandıran suallar cavablandırılıb.

# ADPU-nun Şəki Filialının ingilis dili müəllimləri üçün təlim keçirilib

İyunun 10-14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialında ingilis dili müəllimləri üçün təlim keçirilib. Təlim ADPU və ABŞ Səfirliyinin birgə bağladığı memorandum əsasında Amerika Birləşmiş Ştatları Dövlət Departamentinin maliyyələşdirdiyi "İngilis dili mütəxəssisi (English language Specialist)" təqaüd proqramı xətti ilə mütəxəssis Mary Diane Whaleyin rəhbərliyi altında həyata keçirilib.



Təlimin ilk günü - açılış mərasimində ADPU-nun Şəki Filialının direktoru, dosent Rafiq Rasulov və ADPU-nun Beynəlxalq əlaqələr şöbəsinin müdiri Fuad Tağızadə iştirak ediblər. Təlimdə müəllimlər kommunikativ metoddan istifadə etməklə dinləmə, danışıq, oxu və yazı bacarıqlarının öyrədilməsi istiqamətində təlimatlandırılıb.

Təlim iyunun 14-də başa çatıb. Bağlanış mərasimində ADPU-nun Şəki filialının direktoru, dosent Rafiq Rasulov, ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, ABŞ Səfirliyinin nümayəndələri Ramina Mürşüdova və Aydan Əsgərova iştirak ediblər.

Təlimdə 18 nəfər ingilis dili müəllimi iştirak edib və onlar sonda sertifikatlarla təltif olunublar.

## Allah rəhmət etsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan tarixi kafedrasının dosenti Müzəffər İsayevə bacısı

**Dursun İsayevanın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: Günay BAĞIRLI

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 2158
Sayı: 1500
Çapa imzalanıb: 28.06.2019-cu il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, "Azərbaycan" Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.